DOI: 10.36719/AEM/2007-2020/53/34-37

**Nəhayət Mübariz qızı Hüseynli**
Bakı Slavyan Universiteti

# TARAS ŞEVÇENKO BƏDİİ İRSİNİN AZƏRBAYCANDA TƏDQİQİ

***Açar sözlər:*** *Taras Şevçenko, tərcümə, Kobzar, ədəbiyyat, yubiley, məqalə*
***Key words:*** *Taras Shevchenko, translation, Kobzar, literature, anniversary, article*
***Ключевые слова:*** *Тарас Шевченко, перевод, Кобзарь, литература, юбилей, статья*

Azərbaycan xalqı ilə Ukrayna xalqları arasında sıx münasibətlər lap qədimdən mövcud olmuşdur. Bu münasibətlər tarixən davam edir və bu gün də davam etməkdədir. Azərbaycan və Ukrayna iqtisadi, mədəni və siyasi əlaqələri sürətlə inkişaf edir.

Hər iki ölkə SSRİ-nin tərkibində müttəfiq respublika olmuşlar. Elə həmin dövrdə də onlar arasında iqtisadi və mədəni əlaqələr formalaşmışdır. SSRİ dağıldıqdan, postsovet məkanında müstəqil dövlətlər yarandıqdan sonra bu münasibətlər daha da inkişaf etməyə başlamışdır. Bu münasibətlər tarixən mövcud olub və bu gün də davam edir. Azərbaycan xalqını Ukrayna Respublikasının Krım yarımadasında yaşayan türkdilli xalq - krım tatarları ilə daha sıx tellər bağlayır. Krım türklərindən olan İsmayıl Qaspiralı, Mustafa Krımoğlu və s. Azərbaycanda hörmətlə yad edilir. 1930-cu illərdə ukraynalılar da Azərbaycan xalqı kimi Stalin rejiminin repressiyalarına məruz qalıb. Ukraynada təxminən 500 min azərbaycanlı yaşayır. Bu ölkədə güclü Azərbaycan diasporu fəaliyyət göstərir. Onlar ictimai-siyasi proseslərdə fəal iştirak edirlər. Azərbaycanlılar rəhbər vəzifələrdə də təmsil olunublar. Azərbaycan Respublikası Mədəniyyət Nazirliyi və Ukrayna Mədəniyyət və İncəsənət Nazirliyi arasında mədəniyyət və incəsənət sahəsində əməkdaşlığa dair saziş imzalanıb. 1998-ci ildən etibarən Bakı Slavyan Universitetində Ukrayna dili tədris olunur. 17 oktyabr 2001-ci ildə BSU-da Ukrayna tədris-mədəniyyət mərkəzi açılıb. 7 sentyabr 2006-cı ildə Ukrayna ilə Azərbaycan arasında dostluq əlaqələrinin möhkəmlənməsində, ölkələrimiz arasında elm, təhsil və mədəniyyət sahələrində əməkdaşlığın genişlənməsi və dərinləşməsində xidmətlərinə görə Ukrayna Respublikasının Prezidenti cənab Viktor Andreyeviç Yuşşenkoya Bakı Slavyan Universitetinin Fəxri doktoru adı verilib. Ukrayna-Azərbaycan münasibətlərinin təməlini mədəni, həmçinin ədəbi əlaqələr təşkil edir. Azərbaycanda daim Ukrayna ədəbiyyatına, nasır və şairlərin yaradıcılığına böyük maraq olmuşdur. Xüsusi olaraq Ukrayna şairi Taras Şevçenkonu qeyd etmək olar. Təsadüfi deyil ki, Bakı şəhərinin mərkəzi küçələrinin birində T.Şevçenkonun abidəsi ucaldılmışdır. Abidənin açılış mərasimində Azərbaycanın prezidenti İlham Əliyev və Ukraynanın prezidenti Viktor Yuşenko iştirak etmiş idilər.

Azərbaycan Respublikası ilə Ukrayna arasında genişlənən əməkdaşlıq nəticəsində 2000-ci ildə Ukraynanın paytaxtı Kiyev şəhərində Heydər Əliyev adına Siyasi və Sosial Elmlər İnstitutu açılıb. Ukraynada xalqımızın dahi şairi Səməd Vurğunun anadan olmasının 100 illiyinə həsr edilmiş tədbir keçirilib. 1978-ci ildə Kiyevdə şairin adı verilmiş kitabxana yüksək səviyyədə təmir edilərək oxucuların ixtiyarına verilib.

Azərbaycan xalqı T.Şevçenkonun yaradıcılığı ilə yaxından tanış olmuşdur. XIX əsrdə Azərbaycanın ən görkəmli ədəbiyyat xadimləri, ziyalıları T.Şevçenko ilə müəyyən dərəcədə tanış ola bilmişlər. Xalqımızın ən mütərəqqi ziyalıları T.Şevçenkonun həyat və yaradıcılığına yaxından maraq göstərmişlər. Azərbaycanda sovet hakimiyyətinin qələbəsindən sonra T.Şevçenkonun həyat və yaradıcılığına maraq xeyli artmışdır. 30-cu illərdən etibarən şairin ədəbi irsinin öyrənilməsinə və əsərlərinin Azərbaycan dilinə tərcüməsinə başlanmışdır. Şairin 120 illiyi ilk dəfə Azərbaycan dilində T.Şevçenkonun şeirlər kitabı çapdan çıxmışdır. Kitaba "Kobzar" adı verilmişdir. Burada toplanılmış şeir və poemaları istedadlı şairlərimiz Mikayıl Müşfiq və Əhməd Cavad tərcümə etmişlər. Kitabın giriş məqaləsinin müəllifi isə Məmməd Arif olmuşdur. Müqəddimə Ukrayna şairinin həyat və yaradıcılığı haqqında maraqlı, ədəbi-bədii portet-oçerkdir. Əslində bu məqalə Azərbaycanda Şevçenko ədəbi irsinin öyrənilməsi və tədqiqi sahəsində ilk uğurlu addımlardan biridir. .

Taras Şevçenkonun 125 illiyi (1943-cü il) Azərbaycan ədəbi ictimaiyyəti tərəfindən xüsusi təntənə ilə qeyd edilmişdir. Bu əlamətdar hadisəyə xüsusi hazırlıq görülmüşdür. Hələ yubileydən bir il əvvəl Azərbaycan dövri mətbuatı T.Şevçenkoya dair məqalələr çap etmiş, şairlərimiz isə yeni tərcümələr üzərində işləmişlər. Bu baxımdan, A.Korneyçukun "Taras Şevçenko" məqaləsi, eləcə də, "Ədəbiyyat qəzeti"ndə çap olunan "Qorki Şevçenko haqqında", "Taras Şevçenko haqqında yeni sənədlər" xüsusi diqqətə layiqdir.

1938-ci ilin oktyabr ayında Süleyman Rüstəm və Rəsul Rza Şevçenko yubileyinə hazırlıq işləri ilə əlaqədar Kiyevə getmişlər. Onlar qardaş Ukrayna yazıçıları ilə görüşmüş, Şevçenkonun qəbrini ziyarət etmiş

və Azərbaycanda keçiriləcək yubiley üçün materiallar toplamışlar. Bunlar barədə Süleyman Rüstəm özünün "Şevçenkonun vətənində" adlı məqaləsində ətraflı məlumat vermişdir. Azərbaycan Yazıçılar İttifaqı o zaman Şevçenkonun əsərlərini dilimizə tərcümə etmək üçün S.Rüstəmin rəhbərliyi altında M.Rahim, R.Rza, A.Faruq, N.Rəfibəyli, M.Dilbazi, B.Qasımzadədən ibarət şairlər qrupu yaradılmışdır. 1938-ci ilin yanvar ayında Azərbaycan Sovet Yazıçıları İttifaqı T.Şevçenkoya həsr olunan ən yaxşı hekayə və şeirlər üçün müsabiqə elan etmişdir. Ədəbiyyatşünas Mikayıl Rəfilinin yubiley ərəfəsində «Taras Şevçenko» adlı kütləvi oçerki kitab şəklində çapdan buraxılmışdır. M.Rəfilinin bu oçerki Azərbaycan ədəbiyyatşünaslığında Ukrayna şairinə həsr edilən ilk monoqrafik tədqiqat kimi böyük əhəmiyyət kəsb edir. Kitab 12 bölmədən ibarətdir. Bu bölmələrin hər biri maraqlı və əhatəli qaydada şairin yaradıcılığının Azərbaycan və dünya oxucusuna təqdimatı kimi dəyərləndirilə bilər. Bunu bölmələrin adlarından da anlamaq olur: "Xalq şairi", "Şevçenkonun uşaqlığı", "İlk qədəmlər", "Xalqın sədaqəti uğrunda", "Revolyusion mübarizə", "Çarizm əleyhinə", "Şevçenko və xalqlar qardaşlığı", "Sürgün illəri", "Rus ədəbiyyatı və Şevçenko", "Şairin ölümü", "Şevçenko və epoxamız" - əsasında yazılmış oçerk Azərbaycan oxucusunda T.Şevçenkonun həyat və yaradıcılığı haqqında tam və ətraflı təsəvvür yaratmaq qüdrətinə malikdir.

T.Şevçenkonun 125 illik yubileyi ərəfəsində Azərbaycan dilində onun iki şeirlər kitabı nəşr olunmuşdur. Həmin kitabların hər ikisi "Seçilmiş əsərlər" adlanır, lakin onlardan birincisini "Azərnəşr" (redaktorları M.Arif və R.Rza), ikincisini "Ədəbiyyat nəşriyyatı" (redaktoru M.Arif) çapdan buraxmışdır. Birinci kitaba T.Şevçenkonun 1839-1860-cı illər arasında yazdığı şeirlər» (tərcüməçilər: S.Rüstəm, M.Dilbazi, R.Mikayıl, A.Faruq, O.Sarıvəlli, B.Qasımzadə) və poemaları "Səhrayı qız" (tərçümə edəni S.Vurğun), "Katerina" (R.Nigar), "Qaydamaklar" (R.Rza), "Çavaq" (R.Mikayıl), "Qamaliya" (A.Faruq), "Yuxu" (R.Mikayıl), "Muzdur qadın" (R.Rza), "Knyaz qızı" (A.Faruq), "Çarlar" (B.Qasımzadə) daxil edilmişdir. Bu kitaba Arif Rəfili «Ukrayna xalqının dahi şairi» adlı müqəddimə yazmışdır.

Gənc oxucular üçün nəzərdə tutulan ikinci kitaba T.Şevçenkonun doqquz şeri və üç poeması daxil edilmişdir. Bu kitaba Məmməd Arif "Taras Şevçenko" adlı müqəddimə yazmışdır. Bundan başqa 1939-cu ildə Cəfər Cəfərovun «Ukrayna xalqının böyük şairi», Hüseyn Mehdinin "Dahi xalq şairi" və bir sıra başqa məqalələr də şairin həyat və yaradıcılığının elmi tədqiqi üçün böyük töhvədir. Yubiley günlərində Azərbaycan Sovet Yazıçıları İttifaqı T.Şevçenko haqqında yazılan ən yaxşı bədii əsərlərin müsabiqəsini yekunlaşdırmışdır. Müsabiqə komissiyasına 45 poema, şeir və hekayə göndərilmişdir. Bütün bu əsərlər nəzərdən keçirildikdən sonra birinci mükafat «Taras» poemasını yazmış şair Zeynal Xəlilə verilmişdir. İkinci mükafatlar "Dövranım gözəl" və «Böyük Kobzar haqqında nəğmə» poemasına görə M.Rahimə və P.Pançenkoya (K.Stroqanovla birlikdə), üçüncü mükafatlar «Şairin macərası» poemasına görə T.Əyyubova verilmişdir.

T.Şevçenkonun yaradıcılığı Azərbaycan xalqına həmişə doğma və əziz olmuşdur.

T.Şevçenkonun vəfatının 90 illiyi zamanı onun ayrıca şeirlər məcmuəsi çap olunmuşdur. Bu məcmuəyə yeni tərcümələr daxil edilmiş və ona ədəbiyyatşünas Əkbər Ağayev müqəddimə yazmışdır. Şairin seçilmiş əsərlərinin bu nəşri bədii tərcümənin keyfiyyəti baxımından bir qədər uğursuz olsa da, bütünlükdə Azərbaycan şevçenkoşünaslığı sahəsində irəliyə atılan qiymətli addım kimi qəbul edilə bilər. Həmin günlərdə Azərbaycan Yazıçıları İttifaqında T.Şevçenkoya həsr edilmiş gecə keçirilmiş və burada M.Rəfili məruzə etmişdir. O zaman Azərbaycan dövri mətbuatında T.Şevçenkoya dair bir sıra məqalələr çap edilmişdir ki, bunların içərisində xüsusilə tənqidçi Hidayət Əfəndiyevin «Taras Şevçenko» məqaləsi yeni və orijinal təsir bağışlayır.

T.Şevçenkonun vəfatının 100 illiyi ərəfəsində də Azərbaycanda yubiley komissiyası yaradılmışdı: S.Rüstəm (sədr), M.Hüseyn, Ə.Cəmil, İ.Nəzərov, Z.Xəlil, Q.Qasımzadə, P.Xəlilov, yubiley münasibətilə bir sıra tədbirlər görülmüş, respublikamızın bütün rayonlarında və Bakıda təntənəli yubiley yığıncaqları keçirilmişdir. Bütün bunlar böyük sənətkarın həyat və yaradıcılığını xalqımıza daha da yaxından tanıtmaq üçün mühüm əhəmiyyət kəsb etmişdir.

Onun bütün poeziyası, incə lirikası, dərin mənalı poemaları, hətta gündəlikləri belə xalqla möhkəm bağlılığın ən gözəl ifadəsi olub, işıqlı gələcəyin həsrəti ilə çırpınan bir qəlbin müxtəlif məzmunlu, lakin eyni ahəngli nəğmələridir. Məhz buna görə də, onun zəmanəsinin siyasi-ictimai mənzərəsini əks etdirən həmin nəğmələri öz dövrünün gur səsi olmuşdur.

T.Şevçenkonun anadan olmasının 150 illiyi Azərbaycanda olduqca yüksək səviyyədə qeyd olunmuşdur. Yubiley ərəfəsində T.Şevçenkonun seçilmiş əsərlərindən ibarət yeni kitab - "Kobzar» nəşr olunmuşdur. M.Arif, P.Xəlilov, Ə.Ağayev, Y.Qarabağlı və başqa tanınmış ədəbiyyatşünaslarımızın məqalələri T.Şevçenkonun həyat və yaradıcılığına, bədii irsinə dair yeni və qiymətli fikirlərlə zəngindir. Bu baxımdan, akademik M.Arifin «Böyük Kobzar» məqaləsini xüsusi qeyd etmək olar.

"Şevçenkonun mənalı həyatı, zəngin yaradıcılığı, arzu və əməlləri bizim üçün, yeni və azad həyat quran insanlar üçün həmişə canlı, əziz və qiymətlidir. O, bizim müasirimizdir. O da öz böyük humanist arzuları, alovlu inqilabçı qəlbi, ürəkləri fəth edən şeirləri ilə bu gün bizimlə bir yerdə, çiyin-çiyinə kommunizm cəmiyyətinə doğru addımlayır" (2). «Böyük Kobzar» məqaləsində T.Şevçenkonun yaradıcılığı XIX əsr Ukrayna ictimai-fəlsəfi fikrinin fonunda nəzərdən keçirilir ki, bu da müəllifə dahi şairin həyat və yaradıcılığını daha obyektiv və dərindən öyrənmək imkanı vermişdir. 1964-cü ildə T.Şevçenkoya həsr edilmiş ayrıca iki kitab da nəşr olunmuşdur. Bunlar akademik M.Cəfərin «T.Şevçenko» (həyat və yaradıcılığı) və professor P.Xəlilovun «Ukraynanın böyük Kobzarı» əsərləridir.

Akademik M.Cəfər öz yazısında aşağıdakı fikirləri qeyd etmişdir: «Böyük kobzar mütərəqqi müasir ideyalarla zəngin olan siyasi-ictimai-fəlsəfi fikrə yeni bir istiqamət verdi, yeni Ukrayna ədəbiyyatının banisi, atası oldu. Həm məfkurə, həm də bədii sənətkarlıq cəhətindən elə bir ədəbi irs qoyub getdi ki, Ukraynanın ondan sonra gələn Panas Mirnı, İvan Franko, P.A.Qrabovski, M.M.Kotsyubinski, Lesya Ukrainka kimi görkəmli inqilabçı yazıçıları iftixar hissi ilə onu özlərinin böyük müəllimi hesab etdilər, Şevçenko ənənələrini davam və inkişaf etdirməklə şöhrətləndilər».

Məqaləni ətraflı şəkildə prof. V.Arzumanlı təhlil etmişdir: "Dahi şairin sənətkarlıq xüsusiyyətləri və qələmə aldığı mövzu rəngarəngliyinə də xüsusi diqqət yetirən M.Cəfər, onun bədii irsinin əhəmiyyətini düzgün müəyyənləşdirir. Bu barədə «Şevçenko yalnız Ukraynanı deyil, bütün Rusiyanı, Rusiyada yaşayan xalqların taleyini düşünür, bütün xalqların zəhmətkeşlərini azad görmək istəyirdi» - deyən müəllif Ukrayna şairinin beynəlmiləl bir səciyyə daşıyan yaradıcılığını layiqincə qiymətləndirir. O, həmin qeydlərini yekunlaşdıraraq yazır: «Taras Şevçenko elə mənalı, elə zəngin bir ədəbi irs qoyub getmişdir ki, bu irs bütün xalqlar üçün onların eyni böyük məqsədlər uğrunda mübarizə aparan doğma yazıçılarının irsi qədər əziz və anlaşıqlıdır" (2). Professor P.Xəlilov da 1961 və 1964-cü illərdə nəşr etdirdiyi «Ukraynanın böyük Kobzarı» kitabı şevçenkoşünaslıq sahəsində diqqəti cəlb edən əsərlərdəndir.

Ötən əsrin 60-70-ci Azərbaycan-Ukrayna ədəbi əlaqələrinin tarixini öyrənən Abbas Abdullanın, Tamara Şərifli bir sıra yeni məqalələr yazılmışdır. Bu illərdə T.Şevçenko irsinin Azərbaycan dilinə birbaşa orijinaldan tərcüməsi xüsusilə diqqəti cəlb edir. Bu işdə tərcüməçi, ukraynaşünas Abbas Abdullanın böyük əməyi olmuşdur.

Azərbaycan Yazıçılar Birliyinin Natəvan klubunda görkəmli Ukrayna şairi, yazıçı və dramaturq Taras Şevçenkonun 200 illik yubileyinə həsr olunmuş tədbir keçirilib.

2014-cü ildə Ukraynada çıxan nüfuzlu "Den" qəzetində Azərbaycanın bu ölkədəki səfirinin Taras Sevçenko və ölkəmizdə Böyük Kobzarın irsinin öyrənilməsi haqqında məqaləsi dərc edilmişdir. Səfir öz məqaləsində vurğulayır ki, Böyük Kobzarın yaradıcılığı Ukrayna xalqının milli dirçəlişinə xeyli kömək etmişdir. Müəllif materialın xeyli hissəsini "Şevçenko və Azərbaycan" mövzusuna həsr etmişdir. Məqalədə qeyd olunur ki, Böyük Kobzarın zəngin ədəbi irsi, onun həyat və yaradıcılıq yolu Azərbaycan ədəbiyyatşünaslarının maraqlı tədqiqatlarının mövzusu olmuşdur və bu gün də belədir. Diplomat xatırladır ki, T.Şevçenkonun "Kobzar" kitabı Azərbaycan dilində ilk dəfə 1934-cü ildə nəşr olunmuşdur. Həmin kitabı dilimizə tərcümə etmiş məşhur şairlər Əhməd Cavad və Mikayıl Müşfiq Stalin repressiyalarının qurbanları olmuş və 1937-ci ildə "xalq düşmənləri" kimi güllələnmişlər.

Sonrakı illərdə Taras Şevçenkonun poeziya məcmuələri Səməd Vurğun, Süleyman Rüstəm, Rəsul Rza, Osman Sarıvəlli, Mirvarid Dilbazi, Nigar Rəfibəyli və başqa şairlərin tərcümələrində 10 dəfədən çox nəşr olunmuşdur. Tanınmış ukraynaşünas və şevçenkoşünas Abbas Abdulla tərəfindən tərtib edilmiş "Mənim fikirlərim" kitabı da işıq üzü görmüşdür. Məqalənin sonunda qeyd edilir ki, Azərbaycanda Taras Şevçenkonun əsərlərini bu gün də böyük məmnuniyyətlə oxuyurlar, çünki onun poeziyası vətənə sevgi, yüksək insani duyğular oyadır.

2014-cü ildə professor Vaqif Arzumanlının geniş tədqiqat və faktiki materiallarla zəngin olan "Taras Şevçenko və Azərbaycan" məqaləsi dərc olunmuşdur (2). Məqalədə müəllif zəngin material istifadə edərək Kobzarın yaradıcılığının ölkəmizdəki tədqiqi və öyrənilməsini xronikal şəkildə təqdim edir.

## Ədəbiyyat

1. И.Габиббейли, В.Арзуманлы Т.Г.Шевченко и Азербайджан // "Бакинский рабочий" от 18 марта 2014 г. С.5-6.
2. V.Arzumanlı. Taras Şevçenko irsinin tədqiqi // "Respublika" qəzeti, 23 fevral 2014,
3. "В Баку открыт памятник выдающемуся украинскому поэту Тарасу Шевченко". Bakinskiy Raboçiy. 1 iyul 2008: 3.
4. Jump up to: Rafael Həsənov. (29 mart 2008). "В столице Азербайджана появится памятник Тарасу Шевченко". Kavkazskiy Uzel.

5. Jump up to:[1] [2] [3] Памятник Т. Г. Шевченко в г.Баку // Ukrainskiy konqress Azerbaydjana.
6. http://allpoetry.com/poem/4937927-Shevchenko--The-Dream--translation--by-Vera-Rich

**Research of Taras Shevchenko`s artistic heritage in Azerbaijan**

**Summary**

Taras Shevchenko is a Ukrainian poet, artist, thinker, as well as the founder of critical realism and revolutionary – democratic current in Ukrainian literature and fine arts. The Ukrainian people called him “Kobzar”. He got acquainted with the work of T.Shevchenko in Azerbaijan. At that time. The Writers` Union of Azerbaijan organized a brigade of poets under the leadership of S.Rustam, consisting of M.Rahim, R.Rza, A.Farug, N.Rafibeyli, M.Dilbazi, B.Gasimzade to translate Shevchenko`s works into our language. A new stage in the study of T.Shevchenko`s legacy in Azerbaijan is connected with the 60s and 70 s of the last century. A scientific-practical conference on “Shevchenko`s word in the spiritual space of Azerbaijan” was held at the initiative of the Azerbaijani Embassy in Ukraine, organized by the Kiev National Linguistic University and the Samad Vurgun Library in the city.

**Изучение художественного наследия Тараса Шевченко в Азербайджане**

**Резюме**

Тарас Шевченко – это украинский поэт, художник, мыслитель, основатель критического реализма и революционно-демократического направления в украинской литературе и изобразительном искусстве. Украинский народ назвал его "Кобзарь". В Азербайджане творчество поэта всегда вызывало большой интерес. Более тесно азербайджанский народ ознакомился с творчеством Шевченко в советское время. Видные деятели литературы М.Рахим, Р. Рза, А. Фаруг, Н.Рафибейли, М.Дилбази, Б.Гасымзаде перевели стихи автора на азербайджанский язык, написали очень интересные статьи, посвящённые его творческому наследию. В советское время многократно переиздавались сборники стихов поэта, была написана коллективная монография, охватившая все стороны его творческого и жизненного пути.

**Rəyçi: dos. D.Hümbətova**

Göndərilib: 02.05.2020 Qəbul edilib: 04.05.2020

## HÜQUQ THE LAW ПРАВО

DOI: 10.36719/AEM/2007-2020/53/38-40

**Oktay Etibar oğlu Əhmədov**
Bakı Dövlət Universiteti
okktayahmedov@gmail.com

# SÜLH VƏ İNSANLIQ ƏLEYHİNƏ CİNAYƏTLƏRLƏ MÜBARİZƏYƏ MÜASİR BAXIŞ

***Açar sözlər:*** *Beynəlxalq cinayətlər, sülh və insanlıq, hüquqi məsuliyyət, soyqırım, təhlükəsizlik, işgəncə*
***Key words:*** *International crimes, peace and humanity, legal responsibility, genocide, security, torture*
***Ключевые слова:*** *Международные преступления, мир и гуманность, юридическая ответственность, геноцид, безопасность, пытки*

## Giriş

Milli cinayət hüququ dövlətlərin daxili hüquq qaydasını cinayətkar əməllərdən qorumaq məqsədi daşıdığı halda, beynəlxalq cinayət hüququ bu hüququn müxtəlif sahələrini cinayətlərdən mühafizə etmək məqsədi daşıyır. Cinayətlərin beynəlxalqlıq xarakteri onların bir dövlətin yuristiksiyası ilə məhdudlaşmaması deməkdir. Beynəlxalq hüquq ədəbiyyatlarına nəzər salsaq, "sülh əleyhinə cinayətlər" və "insanlıq əleyhinə cinayətlər" elmi baxımdan bir-birindən fərqləndirilir. Bəzi mənbələrdə isə bu kateqoriya cinayətlər "sülh və bəşəriyyətin təhlükəsizliyi əleyhinə cinayətlər" adlandırılır. Bu cinayətlər üçün belə xarakteristika müəyyən edə bilərik ki, cinayətin tərkibini yaradan əməl əvvəlcədən planlaşdırılmalı və sistemli şəkildə həyata keçirilməlidir. Bu cür əməllərin törədilməsi onların dəfələrlə yerinə yetirilməsinə gətirib çıxara bilər. Bu tələb isə ümumi plan, dövlət siyasəti çərçivəsində yerinə yetirilmiş əməllərin təsadüfi hesab olunması fikrini alt-üst edir, yəni əvvəlcədən planlaşdırılmış hər hansı bir əməl təsadüfi sayılmamalıdır. Bundan başqa isə, qeyri-insani əməl geniş miqyasda törədilməlidir. Eyni zamanda, bu cinayətin törədilməsi şəxsin öz təşəbbüsü ilə həyata keçirilməlidir.

## Beynəlxalq cinayət kimi sülh və insanlıq əleyhinə cinayətlərin anlayışı və təsnifatı

İlk dəfə "insanlıq əleyhinə cinayətlər" anlayışına Nürnberq Beynəlxalq Hərbi Tribunalının Nizamnaməsində rast gəlinmişdir. Nizamnamənin 6-cı maddəsində sülh və insanlıq əleyhinə cinayətlər belə təsnif edilir:

1) Sülh əleyhinə cinayətlər – təcavüz, soyqırımı, terrorizm, Birləşmiş Millətlər Təşkilatı (BMT) heyətinə qarşı cinayətlər, müharibə cinayətləri - Təcavüzkar müharibənin, eyni zamanda beynəlxalq müqavilə, saziş və etimadnamələri pozmaqla müharibənin planlaşdırlması, hazırlanması, başlanması və ya sadalanan fəaliyyətlərdən hər hansı birinin həyata keçirilməsinə yönəlmiş ümumi planda və qəsdlərdə iştirak etmək və s.

2) İnsanlıq əleyhinə cinayətlər – insan (qul, uşaq, qadın) alveri, fahişəliyin üçüncü şəxslər tərəfindən istismarı, aparteid, deportasiya və digər qeyri-insani hərəkətlər və ya siyasi, irqi, dini motivlərə əsasən mülki əhalini təqib etmə, kölə vəziyyətinə salma, işgəncə vermə, girov götürülmə,müharibəyə qədər və müharibə zamanı adamöldürmə, əhalini məhv etmə, insan hüquqlarının kütləvi və sistematik şəkildə pozulması və s.

Birinci kateqoriya daha çox ictimai təhlükəliliyi ilə xarakterizə olunur və burada qəsd obyekti qismində dövlətlərarası münasibətlər, xalqların dinc yanaşı yaşaması, xalqın, millətin bütövlükdə beynəlxalq sistemdə varlığı və taleyi, beynəlxalq əmin amanlıq, təhlükəsizlik və s. kimi daha qlobal mahiyyətli məsələlər tanınır. İkinci kateqoriya – insanlıq əleyhinə cinayətlər isə daha çox müasir dövrün beynəlxalq hüquq norma və prinsiplərində etiraf olunan cinayətlərdir.

Hüquq üzrə fəlsəfə doktoru Ə.Allahverdiyev hesab edir ki, insanlıq əleyhinə cinayətlərə aid normalar həm beynəlxalq, həm də milli səviyyədə kifayət qədər təfsir və tətbiq edilməmişdir (3, 15).

Yuqoslaviya (YBCT) və Ruanda (YBCT) Beynəlxalq Cinayət Tribunallarının təcrübəsi bu baxımdan xüsusi əhəmiyyət kəsb edir, bununla belə, onların presedent hüququ insanlıq əleyhinə cinayətlərin hamısını əhatə etmir. "Qarışıq" və ya "beynəlmiləlləşdirilmiş" tribunalların da bu sahədə töhfəsi hələ ki, nəzərəçarpacaq səviyyədə deyil. Ayrı-ayrı ölkələrin məhkəmələrində insanlıq əleyhinə cinayətlərlə bağlı nadir hallarda işlərə baxılsa da, Azərbaycan Respublikasının məhkəmələri tərəfindən bu günə qədər Cinayət Məcəlləsinin müvafiq maddələri (105-113-cü maddələr) bir dəfə də olsun tətbiq edilməmişdir (4, 20).

1998-ci ilin iyul ayında Beynəlxalq Cinayət Məhkəməsinin Statutu (Roma Statutu) qəbul olunmuşdur və bu proses hal hazıra qədər davam etməklə, beynəlxalq cinayətlər, o cümlədən sülh və insanlıq əleyhinə cinayətlər məsələsi, habelə onların təsnifatı, yurisdiksiya şərtləri ilə bağlı yekun razılaşmalar əldə edildi.

XX əsr ərzində sülh və insanlıq əleyhinə cinayətlərlə bağlı bir sıra mühüm beynəlxalq müqavilələr də imzalanmışdır ki, onlar da əsas etibarilə qeyd olunan cinayətlərin mahiyyəti və onlara görə mühakimə icraatı üzrə milli və beynəlxalq hüquqi əməkdaşlığı şərtləndirir. Bunlardan: Soyqırımı cinayətinin qarşısının alınması və cəzalandırılması haqqında 1948-ci il Konvensiyası; Müharibə qurbanlarının müdafiəsinə dair 1949-cu il Cenevrə Konvensiyaları; Aparteid cinayəti ilə mübarizə və onun cəzalandırılması haqqında 1973-cü il Konvensiyası; İşgəncə və digər qəddar, qeyri-insani və ya ləyaqəti alçaldan rəftar və ya cəza növləri əleyhinə 1984-cü il Konvensiyası; Nürnberq, Tokio, Yuqoslaviya və Ruanda tribunallarının Hokmləri və Nizamnamələri; Beynəlxalq Cinayət Məhkəməsinin Statutu; Beynəlxalq Cinayət Polisi Təşkilatının (İnterpol) Nizamnaməsi və s. müqavilə, pakt və konvensiyaları qeyd etmək olar. Beləliklə, müasir beynəlxalq hüququn inkişaf meyillərini nəzərə alaraq, biz beynəlxalq cinayətə, sülh və insanlıq əleynə cinayətlərə ümumi şəkildə şərti olaraq aşağıdakı anlayışı verə bilərik: Beynəlxalq toplumun qanuni maraq və mənafeləri, insan hüquq və azadlıqları, habelə sülh və təhlükəsizlik əleyhinə yönələn transmilli ictimai təhlükəli xarakterə malik olan və beynəlxalq cinayət hüquqi yuridiksiyanın şamil olunduğu əməllər beynəlxalq cinayətlər hesab edilir. Sülh və insanlıq əleyhinə cinayətlər isə beynəlxalq cinayətlərin əsas növü olub, dövlətlər arasında sülhə və əmin-amanlığa, ümumbəşəri dəyərlərə, insana və insanlığa qarşı yönələn birbaşa qəsdlə xarakterizə olunan transmilli cinayətlərdir.

Müasir beynəlxalq hüquqa görə beynəlxalq hüququn yol verdiyi çərçivədə hər bir dövlət nəinki beynəlxalq sülh və təhlükəsizliyin təmininə dair tədbirlər görmək, həmçinin, başqa dövlətlərin də sülhün təmininə dair beynəlxalq hüquq normalarına əməl etmələrini tələb etmək hüququna malikdir. Dövrün ən aktual problemlərindən biri də beynəlxalq cinayətlərlə, sülh və insanlıq əleyhinə cinayətlərlə mübarizə, onların qarşısını alınması problemidir. Nəzərə alsaq ki XXI əsrdə dövlətlərin qarşısında duran ümumi vəzifə sülh və inkişafa can atmaqdır, cəmiyyətin bütün sahələrində təhlükəsizlik problemini həll etməklə buna nail olmaq olar.

Bəşəriyyətin mövcudluğu, onun demokratik və iqtisadi inkişafı üçün ən böyük təhlükələrdən biri beynəlxalq cinayət hesab olunan sülh və insanlıq əleyhinə cinayətlərdir. Bu cür cinayətlərlə mübarizə problemi məhdud milli-dövlət vasitələri və metodları çərçivəsində həll edilə bilməz. Mübarizənin effektivliyinin artırılması üçün dünya ölkələri birliyi tərəfindən müvafiq beynəlxalq hüquqi tədbirlərə əl atılmalıdır.

Respublikamızın müharibə şəraitində olması və torpaqlarımızın 20 %-nin işğal altında olmasını nəzərə alsaq, bu problemin bizim üçün nə qədər böyük əhəmiyyət kəsb etdiyi aydın olar. Azərbaycan xalqı bir neçə dəfə sülh və insanlıq əleyhinə cinayətin-soyqırımın qurbanı olmuşdur. Yalnız bu hadisələrdən birinə- 1918-ci il mart qırğınına siyasi qiymət verilməsinə cəhd göstərilmişdir. Azərbaycan Xalq Cümhuriyyətinin varisi kimi Azərbaycan Respublikası bu gün onun axıra qədər həyata keçirə bilmədiyi qərarların məntiqi davamı olaraq soyqırım hadisələrinə siyasi qiymət vermək borcunu tarixin hökmü kimi qəbul edir.

Sülh və insanlıq əleyhinə cinayətlər öz xarakteri və təhlükəliliyinə görə ümumilikdə beynəlxalq birliyin mənafeyinə zərər vurduğundan beynəlxalq hüquq normalarının üstünlüyünün təmin olunması məqsədilə bilavasitə cinayət yuristiksiyasını həyata keçirməli olan beynəlxalq məhkəmə orqanları təsis edilmişdir. Beynəlxalq tribunalların, daimi fəaliyyət göstərən

Beynəlxalq cinayət məhkəməsinin yaradılması beynəlxalq hüquq normalarının səmərəliliyinin artırılmasına istiqamətlənmişdir.

Beynəlxalq aləmdə baş verən hadisələrin mürəkkəbliyi şəraitində beynəlxalq hüquqi məsuliyyət problemi ən aktual problemlərdən biridir. Beynəlxalq cinayət məsuliyyəti prinsipi yeni dünyagörüşünü əks etdirir və nisbətən yaxn bir dövrün təzahürüdür. Bu prinsip tələb edir ki, dövlətlər beynəlxalq cinayətləri törətməkdə təqsirli bilinən şəxsləri ya özləri mühakimə etməlidir, ya da onu edə biləcək dövlətə verməlidir. Bu cür cinayətlərdə dövlətlərə qarşı ikili standartların tətbiq edilməsi amili tamamilə aradan qaldırılmalı, sülh və ədalətin təmin olunması naminə obyektiv fəaliyyət göstərilməlidir.

Sülh və insanlıq əleyhinə cinayətlər törətmiş şəxslərin səmərəli beynəlxalq cinayət təqibi II Dünya Müharibəsindən sonra 8 avqust 1945-ci ildə Londonda, Böyük Britaniya, ABŞ, Fransa arasında Avropa ölkələrinin əsas hərbi cinayətkarlarının məhkəmə təqibi haqqında imzalanmış razılaşmanın nəticəsində başlanmışdır.

Qeyd edək ki, ən təhlükəli cinayətlər sayılan genosid, insanlıq əleyhinə cinayətlər, hərbi cinayətlər, təcavüz cinayəti Beynəlxalq Cinayət Məhkəməsinin səlahiyyətlərinə daxildir və göstərilən cinayətlərə münasibətdə məhkəmənin yuristiksiyası məcburi xarakter daşımalıdır.

Sülh və insanlıq əleyhinə cinayətlər əvvəlcədən planlaşdırıldığından təsadüfi törədilə bilməz. Bu əməl geniş miqyaslılığı ilə seçilir və əməlin həyata keçirilməsində şəxsin niyəti olur. İnsanlıq əleyhinə cinayətlər həm sülh dövründə, həm də müharibə dövründə törədilə bilər.

Beynəlxalq Sülh və insanlıq əleyhinə cinayətlər anlayışını və bu anlayışın məcmusuna daxil olan fərdi cinayət növlərini tədqiq edərkən aşağıdakı məqsədlər qarşıya qoyulur:

1) Sülh və insanlıq əleyhinə olan cinayətlərin tarixini araşdırmaq;
2) Sülh və insanlıq əleyhinə cinayətlərə qarşı mübarizə və ona görə məsuliyyətin müəyyən olunması;
3) Sülh və insanlıq əleyhinə olan cinayətlərin əsas fərqləndirmə meyarlarının dəqiqləşdirilməsi;
4) Sülh və insanlıq əleyhinə cinayət hesab olunan konkret əməllərin ümumi xarakteristikalarını müəyyən etməklə onları ayrılıqda tədqiq etmək;
5) Sülh və insanlıq əleyhinə olan cinayətlərə görə fiziki şəxslərin cinayət məsuliyyətinin yaranmasının araşdırmaq və onların inkişaf tendensiyalarını tədqiq etmək;
6) Sözü gedən cinayətlərə qarşı Beynəlxalq Cinayət Məhkəməsinin təcrübələrini təhlil etmək və subyektiv fikir formalaşdırmaq;
7) Azərbaycan Respublikasının Cinayət Məcəlləsində təsbit olunmuş insanların sülh və təhlükəsizliyi əleyhinə cinayətlərin müqayisəli hüquqi tədqiqatını aparmaq;
8) İnsanların azadlığı, həyat və sağlamlığı əleyhinə cinayətlərə qarşı mübarizə aparan orqanlar üçün müəyyən təcrübi xarakterli təkliflər və tövsiyələr işləyib hazırlamaq;

**Nəticə**

Sülh və insanlıq əleyhinə cinayətlər bu cinayətlərin miqyası, iştirakçıların dairəsi, onların davranışlarının xüsusiyyətləri ilə təyin olunan, ancaq öz xüsusiyyətlərinə malik olan obyektiv və subyektiv elementlərə malikdir. Sülh və insanlıq əleyhinə cinayətlər beynəlxalq hüquq pozuntularının ayrıca kateqoriyasına daxil olunmalıdır, çünki, belə pozuntular ümumi sülhə təhlükəsizliyə qarşı yönələn hüquqazidd əməldir, beynəlxalq hüquq normalarının və prinsiplərinin pozulması ilə bağlıdır. Sözügedən cinayətlərin qarşısının alınması istiqamətində dövlətlər bir-birilə qarşılıqlı və çoxtərəfli əməkdaşlıq etməli, bu məqsədlə həm daxildə, həm də beynəlxalq səviyyədə lazimi tədbirlər həyata keçirməlidirlər. Belə cinayətlərin törədilməsində təqsirli bilinən şəxslərin saxlanılmasında, mühakimə və həbs olunmasında dövlətlər bir-birinə kömək etməlidirlər. Təqsirli bilinən şəxslərin təqsiri sübuta yetirilərsə onlar cinayət törətdikləri ölkədə mühakimə olunaraq cəzalandırılmalı, bu məsələdə dövlətlər həmin şəxslərin ekstradisiyası ilə bağlı əməkdaşlıq etməli və həmin cinayətlərin araşdırılması üçün məlumatların toplanması və mübadiləsində birgə fəaliyyətə üstünlük verməlidirlər.

**Ədəbiyyat**

1. Azərbaycan Respublikasının Cinayət Məcəlləsi //http:// www.e-qanun.az
2. “Azərbaycanlıların soyqırımı haqqında” Azərbaycan Respublikası Prezidentinin Fərmanı 1998-ci il 26 mart // http:// www.e-qanun.az
3. Allahverdiyev Ə.V. Beynəlxalq hüquqda insanlıq əleyhinə cinayətlər. Dərs vəsaiti. Bakı. “Elm və təhsil” nəşriyyatı, 2017. 396 səh.
4. Məcidli S.T. “Azərbaycanlılara qarşı törədilən sülh və insanlıq əleyhinə cinayətlər (1918-2018-ci illər)”. Bakı: 2018. 271 səh.

**A modern review at peace and crimes against humanity**

**Summary**

Peace and crimes against humanity have objective and subjective elements that are defined by the scale of the crimes, the scope of the participants, and the characteristics of their behavior, but which have their characteristics. Peace and crimes against humanity should be included in a separate category of international law violations, as such violations are related to violations of international law and principles, which are aimed at general peace security.

**Современный взгляд на борьбу с миром и преступления против человечества**

**Резюме**

Мир и преступления против человечества имеют объективные и субъективные элементы, которые определяются масштабом преступлений, масштабами участников и характеристиками их поведения, но имеют свои особенности. Мир и преступления против человечества должны быть включены в отдельную категорию нарушений международного права, поскольку такие нарушения связаны с нарушениями международного права и принципов, которые направлены на обеспечение общей мирной безопасности.

**Rəyçi: prof.Ş.Səmədova**

Göndərilib: 20.04.2020 Qəbul edilib: 22.04.2020

DOI: 10.36719/AEM/2007-2020/53/41-43

**Nargiz Nasimi Mammadova**
Baku State University
nargizm64@gmail.com

## OBLIGATION TO PROVIDE ADEQUATE MEDICAL CARE TO PERSONS IN CUSTODY

***Key words:*** *human rights, prisoners health, international law*
***Açar sözlər:*** *insan hüquqları, məhkumların sağlamlığı, beynəlxalq hüquq*
***Ключевые слова:*** *права человека, здоровье заключенных, международное право*

### 1.1. Introduction

This article deals with the obligation to ensure adequate medical care to prisoners in custody. Prisoners are entitled to receive medical care and mental health treatment. These treatments are only required to be "adequate", not the best available or even the standart treatment for those outside of incarceration. Also this article deals with case-law of the European Court of Human Rights. The prisoners right to receive adequate medical care include which notion of the Article 3 of the European Convention of Human Rights.

### 1.2. General approach

Everyone has the right to health and the States have the obligation to provide standart of public health with the community generally. Human rights are interdependent, indivisible and interrelated. This means that violating the right to health may often impair the enjoyment of other human rights and such as the rights to education or work, and vice versa. States should ensure the provision of enough functioning public health and individual health care facilities throughout their territory, as well as safe water and sanitation facilities, trained and fairly-paid medical professionals, and essential medicines. And also the States have the obligation to ensure medical care for the persons in custody. Each prisoner should receive a comprehensive medical and mental health assessment by qualified medical and mental health professionals no later than [14 days] after admission to a correctional facility, and a comprehensive medical assessment periodically thereafter, which should include mental health screening. The frequency of periodic medical assessments should accord with community health standards, taking account of the age and health status of each prisoner. No new comprehensive medical, mental health assessment need occur for a prisoner transferred or readmitted to a correction facility who has received comprehensive health assessment within the prior year unless it is medically necessary, or the prisoner's medical records are not available and unless a dental emergency requires more immediate attention, a dental examination by a dentist or trained personnel directed by a dentist should be conducted within [90 days] of admission if the prisoner's confinement may exceed one year, and annually thereafter.

The level of health care provided in a prison will depend upon the number of health staff, their qualifications and training, and their motivation and these factors should be assessed during the prison visit. In some contexts the role of health-care staff in prisons may be defined in the country's 'prison regulations', these regulations may specify that prison health staff are responsible not only for running the health-care services, but also for other tasks such as oversight of hygiene, sanitation and nutrition and this is consistent with the ideal that health staff have duties that go beyond curative care: they must also be responsible for protecting and promoting health.

It is important to be clear about what the health professional must not do during an assessment of prison health and in general, he or she should not take over the work of the prison staff or run a parallel health system by performing individual health checks and treating detainees. Prison authorities or members of the prison assessment team should generally not be encouraged to draw up lists of detainees who 'want to see the doctor, however, the health professional should meet selected detainees individually, to discuss issues relating to the health system and the health professional may use general or specific criteria for choosing these detainees. General criteria may include: most recently arrested detainees, female detainees, or detainees above or below a certain age. Specific criteria may include: detainees who have passed through specific places of interrogation, who exhibit features of a particular disease, or who show clear signs of mental illness.

Most aspects of life in detention have some impact on health, the health pyramid describes the basic and essential influences on health in prisons (food and nutrition; hygiene and sanitation; accommodation; health protection and promotion; and, finally, curative health care). However, when assessing health in prisons it is important to look beyond these basic elements and other factors – less obvious, or even invisible – can also

powerfully influence health. They are sometimes loosely called ‘psychosocial factors’, and include: the psychological effects of arrest and imprisonment; separation from support structures; internal prisoner hierarchies; violence including sexual violence; drug use; prison routines; respect or not of judicial guarantees; promiscuity.

It is important while assessing prison health to distinguish between availability and accessibility. AVAILABILITY describes the existence of infrastructure and services within the prison: health-care facilities, drugs, water and sanitation facilities, kitchens, food, etc, and ACCESSIBILITY describes the extent to which detainees have equal access to these facilities and services without barrier or interference. Facilities and services within prisons should operate on the principle of non-discrimination and must be equally accessible to all; they must also acknowledge that certain vulnerable or marginalized groups may have greater needs (for instance, women, children, the elderly, the disabled, those with HIV/AIDS, and ethnic minorityes). Accessibility can be further divided into physical accessibility (for instance, does the location of the facilities interfere with physical access?); economic accessibility; access to information. The accessibility and the quality of services and infrastructure are two of the main determinants of health in prisons.

### 1.3. European norms regulating medical care to persons in custody

Article 3 of the European Convention of Human Rights noted that: No one shall be subjected to torture or to inhuman or degrading treatment or punishment.

It is clear from the judgments of the European Court that the Court finds a substantive violation of Article 3 of the Convention when, as a rule, the relevant evidence of the person's misconduct is presented by the applicant alleging misconduct. This means that the European Court is general acknowledges that, as a rule, the burden of proof on such claims rests with the claimant.

European Court attaches special importance to the opinion of a medical expert, a medical certificate, the results of a medical examination from a temporary detention facility, a record of an ambulance call, or any other medical document, among other evidences of torture and other forms of ill-treatment.

In addition, the European Court emphasizes the importance of witness statements, videos and photographs in the investigation of ill-treatment. However, even in the absence of such evidence, if the plaintiff provides a detailed description of the misconduct and the detailed, consistent evidence he presents provides a reasonable presumption of misconduct in the circumstances under consideration, and the state is unable to substantiate the allegation. It is not excluded that the fact of ill-treatment is considered established.

In such cases, the European Court of Human Rights, taking into account the sensitivity of the situation detainees, their inability to obtain evidence to support their claims and claims, and the state's availability of relevant information and evidence of the incident, notes that the burden falls on the state, not the plaintiff. An example of this is the Court's decision of 13 June 2002 in the case of Angelova against Bulgaria. İn the same case, he applicant's 17-year-old son, Angelova, died at the police station a few hours after his arrest. The applicant alleged that, his son had been injured during his detention by the police and had not been treated. The Court found that the burden of proof in this case fell on the respondent State and State had failed to provide a convincing explonation of the applicant's claim, he reasons for the injuries. In view of this and the fact that the injuries inflicted on a person exceeded the minimum level of ill-treatment provided for in Article 3 of the Convention, the European Court found that there had been a violation of Article 3 in that case. In these and other cases, the European Court has relied on the standard of "proof without reasonable doubt" in relation to both the state and the plaintiff.

If we look at international human rights standards for prison officials, we can see that the basic requirement for all prisoners to undergo a medical examination at the time of admission to a prison or detention facility, and then to receive any necessary medical treatment free of charge, is included in prisoners' health rights. İn the case “Testa v Croatia” the applicant, who has chronic hepatitis with a very high level of viremia, She has unsuccessfully undergone interferon treatment. Due to the effects of that disease her liver is damaged and her general health condition is very bad. People with hepatitis C usually suffer from constant exhaustion; pain in the abdomen, joints and muscles; general sickness and weakness; and often depression. A low-fat diet is required in order to reduce liver damage. The disease is potentially fatal. On an unspecified date the applicant also contracted hepatitis A. In addition to that, she suffers from endometriosis, complained about the lack of adequate medical treatment and check-ups, the inadequate diet and lack of opportunity to have sufficient rest. The European Court of Human Rights held that there had been the violation of Article 3 (prohibition of inhuman and degrading treatment) of the Europen Convention of Human Rights. The Court found that the requisite medical care and assistance for the applicant’s chronic hepatitis coupled with the prison conditions which she had had to endure for more than two years, had diminished the applicant’s

human dignity, aroused in her feelings of anguish and inferiority capable of humiliating and debasing her and possibly breaking her physical or moral resistance.

And also in the case Holomiov v the Republic of Moldova, the applicant alleged that he was detained in inhuman and degrading conditions and that he had not been provided with proper medical care and according to medical certificates submitted by him he suffered from a number of serious illnesses including chronic hepatitis, second-degree hydronephrosis, chronic bilateral pyelonephritis with functional impairment of the right kidney, hydronephrosis of the right kidney with functional impairment, and chronic renal failure. The Court held that there had been a violation of Article 3 (prohibition of inhuman or degrading treatment) of the Convention. It noted in particular that the parties disagreed about the availability of medical care in prison and it considered. However, that the core issue was not the lack of medical care in general but rather the lack of adequate medical care for the applicant's particular conditions. In the present case, the Court observed in particular that, while suffering from serious kidney diseases entailing serious risks for his health, the applicant had been detained for almost four years without appropriate medical care and it therefore found that the applicant's suffering has constituted inhuman and degrading treatment.

## Conclusion

States are obliged to fulfill and have the positive obligations to adequate medical treatment for the prisoners. Each prisoner should receive medical and mental assessment with the available facilities. These treatments required to be "adequate", not the best available or the standart treatment for those, outside of incarceration. The right to receive adequate medical treatment regulated by the Article 3 of the Convention. Inadequate medical care for prisoners is considered torture or inhumane treatment by the European Court of Human Rights.

## Literature

1. European Court on Human Rights. https://www.echr.coe.int/
2. İnsan hüquqları üzrə Avropa Konvensiyasının 3-cü maddəsinin tələblərinə riayət edilməsi və Azərbaycana qarşı qərarların təhlili. 24p
3. Case of Testa v Croatia(Application no.20877/04) http://hudoc.echr.coe.int/eng
4. Case of Angelova v Bulgaria (Application no. 55523/00)
5. Case of Holomiov v the Republic of Moldova (Application no. 30649/05)
6. https://www.echr.coe.int/Documents/FS_Prisoners_health_ENG.pdf
7. Douwe Korff. Human rights handbooks, No.8.
8. A Pocketbook of International Human Rights Standards for Prison Official.2005, 34p.

### Həbsdə olan şəxslərə adekvat tibbi yardım göstərmək öhdəliyi

### Xülasə

Həbsdə olan şəxslərin azadlıq hüququ müvəqqəti məhdudlaşdırıldığına görə onların digər hüquqlarının təmin olunması dövlətlərin müvafiq qurumların qarşısında duran ən vacib vəzifələrdən biridir. Adekvat tibbi yardımın göstərilməsi fiziki və psixi aspektdən həyata keçirilməlidir. Bu baxımdan, həbsdə olan şəxslərə adekvat tibbi yardım göstərmək öhdəliyi xüsusi əhəmiyyət kəsb edir. Məqalədə adekvat tibbi yardımın göstərilməsi ilə bağlı beynəlxalq hüquq normalarına nəzər salınmış, ətraflı təhlil olunmuş, təklif və nəticələr irəli sürülmüşdür.

### Обязательство обеспечить улучшенную медицинскую помощь арестованным лицам

### Резюме

Поскольку право на свободу задержанных временно ограничено, обеспечение их других прав является одной из важнейших обязанностей государств перед соответствующими властями. Адекватная медицинская помощь должна оказываться физически и морально. В связи с этим особое значение имеет обязанность оказывать надлежащую медицинскую помощь задержанным. В этой статье рассматриваются нормы международного права, касающиеся предоставления адекватной медицинской помощи, приводится подробный анализ, а также предлагаются предложения и выводы.

**Rəyçi: h.f.d.G.Rzayeva**

Göndərilib: 09.04.2020 Qəbul edilib: 12.04.2020

DOI: 10.36719/AEM/2007-2020/53/44-47

**Fidan Ağasəlim qızı Abdullayeva**
Bakı Dövlət Universiteti
fidanazmammadova@gmail.com

## ORQAN BANKININ YARADILMASININ ƏHƏMİYYƏTİ

***Açar sözlər:*** *insan orqanı və toxumaları, transplantasiya, donor kartı, donor, resipiyent, insan sağlamlığı, donor bankı, beyin ölümü, orqan bankı*

***Key words:*** *human organs and tissue, transplantation, donor card, donor, recipient, health, donor bank, brain death, organ bank*

***Ключевые слова:*** *человечуеские органы и ткани, трансплантация, донорская карточка, донор, реципиент, здоровье, банк доноров, смерть мозга, банк органов*

İnsanın öz fəaliyyətini tam həyata keçirə bilməsi üçün o fiziki cəhətdən sağlam olmalıdır. Səhhətdə yaranan problemlər nəticəsində həyata keçirilinən hər bir hərəkət öz faydalılığını tam göstərə bilmir. Xarici dövlətlərdə orqana ehtiyacı olan şəxslərin tələbatını ödəmək üçün orqan bankları yaradılır və onların hüquqi bazaları təşkil olunur. Orqan bankları əksər hallarda xüsusi olaraq yaradılmış Orqan fondlarında mərkəzləşdirilir.

Orqanların və toxumaların bağışlanması ilə bağlı olaraq qəbul edilmiş rəsmi sənədlərin tarixi ötən əsrə söykənir. Bu rəsmi sənədlərdən biri 1968 - Vahid Anatomik Bağışlama Qanunu (The Uniform Anatomical Gift Act), hər bir yurisdiksiyada qəbul üçün nəzərdə tutulmuş bir nümunəvi əsasnamədir. Bu qanunun icrası ilə insan orqan və toxumalarının transplantasiya üçün bağışlana biləcəyi hüquqi əsası təmin etdi. Qanuna əsasən ölümdən əvvəl orqanı bağışlamaq üçün insanın qanuni razılığı qəbul edilirdi. 1973-cü il tarixli Xalq Qanunu 92-603, 30 Oktyabr 1972-ci il tarixli Xroniki böyrək xəstəliyi olan bəzi şəxslərə "Medicare" əhatə dairəsini genişləndirmək üçün Sosial Təhlükəsizlik Qanununda dəyişiklik edildi. Bu cür şəxslər Medicare yəni, tibbi qayğıya ehtiyac duyan şəxslər qanunun A və B hissələrində əhatə olunmaq üçün əlil hesab edildi.(1)

1978-ci il tarixli Vahid Beyin Ölümü haqqında Qanun (The Uniform Brain Death Act) - hər bir yurisdiksiyada qəbul edilməsi üçün nəzərdə tutulmuş nümunəvi bir əsasnamə idi. Bu model qanun beynin sümükləri də daxil olmaqla beynin bütün fəaliyyətinin dönməz dayandırılmasının ölüm olduğunu təsbit etdi. 1980-ci il tarixli Ölümün vahid tərifi haqqında qanun (The Uniform Determination of Death Act) -bütün yurisdiksiyalarda qəbul üçün nəzərdə tutulmuş tipik qanundur, hansı ki, beynin ölümü haqqında vahid Qanunu (hansı ki, ölümün müəyyən edilməsinin ənənəvi meyarları nəzərə alınmırdı) əvəz etmişdir. Qanunda deyilir ki, qan dövranının və ya tənəffüsün dönməz dayandırılması və ya beyin gövdəsi də daxil olmaqla, bütün beyin funksiyaları dönməz olaraq dayanmış olan şəxs ölüdür. Ölümün müəyyən edilməsi qəbul edilmiş tibbi standartlara uyğun həyata keçirilməlidir. 1984-cü il tarixli İctimai hüquq (98-507), orqan transplantasiyası üzrə milli qanun (The National Organ Transplant Act), 19 oktyabr 1984-cü il-orqan transplantasiyası üzrə məqsədli iş qrupunun yaradılmasını nəzərdə tuturdu, Səhiyyə və sosial xidmətlər nazirinə orqan satınalma təşkilatları üçün qrant vermək səlahiyyətini verdi, Səhiyyə və sosial xidmətlər naziri tərəfindən qanun əsasında idarə olunacaq Orqan satınalma və transplantasiyası şəbəkəsini (Organ Procurement and Transplantation Network) yaratdı, transipientlərin elmi reyestrini yaratdı və bu fəaliyyətin idarə olunması üçün Səhiyyə və sosial xidmətlər departamentində bir inzibati vahid yaratdı. Orqan transplantasiyası üzrə milli qanununun 301-ci maddəsində orqanların transplantasiya üçün dəyərli nəzərdən keçirilməsi üçün dəyişdirilməsinə qarşı cinayət qadağası daxil edilmişdir.(2)

Qəbul edilmiş rəsmi sənədlərin tələblərini həyata keçirmək üçün dövlətlət tərəfindən orqan nəqli fondları yaradılmışdır. Bunlardan biri də Türkiyədə fəaliyyət göstərən Orqan nəqli fondudur (Turkish Transplant Foundation). 1995-ci ildən böyrəklərin köçürülməsi və diyaliz xəstələrinə xidmət göstərmək üçün yaradılmışdır. 2013-cü ildən Oqan Nəqli Fondu adlandırılmağa başlamışdır. Bütün komponentlərlə işləmək və orqan nəqli sahəsində fəaliyyət göstərən bir qeyri-hökumət təşkilatı olmağın sosial məsuliyyətini dərk edərək ölkədə və dünyada ən yüksək səviyyədə orqan transplantasiyası xidmətlərinin inkişafına töhfə vermək fondun başlıca məqsədidir. Orqan bağışlama və transplantasiya sahəsi bugün səhiyyə xidmətinin ən çox tənzimlənən sahələrindən biridir. Həm dövlət, həm də federal qanunvericilik, bağışlanan orqanların bölüşdürülməsi, paylanması və transplantasiyası üçün ən təhlükəsiz və ən ədalətli bir sistem təmin edilməsi üçün tətbiq edilmişdir. (3)

If a contract is signed for to lease a special vessel due to carrying of goods, shippers must be interested with seaworthiness of the vessel, as other issues such as the freight tariff. Seaworthiness is related with the supplies and also the measure and experience of the crew. The previous group considers that the construction, structure, terms and tool of the vessel must be appropriate for safely transporting of certain types of goods to the destination of goods that these vessels have to be technically fit to meet the usual dangers of travel. One of the especially important issues is crew of vessel. Thus, the lessor is required to employ an experienced master and skilled members. A vessel operated by unexperienced sailors would surely be considered as unseaworthy.

One of the important requirements and conditions is volume of the vessel. Estimating the volume of a vessel is a nautical practice that dates back to biblical times. Early sailors, port officials, and other public bodies utilized different methods to demonstrate the vessel's volume. In the third century, ancient Greeks calculated a volume of the vessel in talents, the Egyptians estimated it in artabs, the Romans calculated in the amphora. Furthermore, sailors of ancient Islam used in irdabb for calculating of amount of specific goods, or general number of passengers and also animals.

Since the biblical period, the naming of the vessels had existed. Vessels' names could be people, spaces, objects, features of vessel, epithets or religious names and also marine nymphs. Furthermore, the naming of the vessel could base on the view of the vessel, its speed, martial features or life-giving deities. As in Egyptian ships, names of realistic and mythological animals are used for naming of the vessels of the Athenian navy. A number of the naming of vessels had reflected names of geographic territories, other names of vessels had associated with political importance or function of ships. Moreover, in the Roma, vessels were named after mythological figures or were used general nouns and adjectives in the names of ships. In the same way, apart from deities, names of geographical territories, rulers and military commanders they used names of real and mythological animals. Naming of warship differed from commercial vessel. Thus, naming of warships based on differentiating a kind of ship or the marine's components. But in the naming of trading vessels, lawful and formal rules were required. Names of vessels had to be included in the hiring agreements that hired special ships to provide that the lessors would not transport the goods on the wrong vessels. If any party or both parties of the contract noted incorrectly the name of the vessel in their contract, the agreement would be determined as invalid contract, particularly if the agreement were signed after leasing of an especial vessel. (6, p. 27-42)

The naming ceremony of the vessel takes place at the shipyard when a new vessel is ready to sail after passing the necessary sea tests. Upon completion of the construction of a ship, the shipowner is informed of the completion and a specific date is set for the naming ceremony. The naming and commissioning procedures are organized to identify the hull. (7)

The one of the main issues is identity of the vessel. When considering the law of the sea, it is necessary to remember that one of its main ideas is that the vessel has its own identity. Unlike ship owners, the vessel has a legal identity. He can sue in the name of the owner and sue in his own name. (8, p. 2-6)

## Conclusion

Based on the above, we can say that vessels are necessary in the carriage of goods by sea. There has been a great demand for the use of ships since ancient times. The types of vessels are classified due to purpose of using of the ships. Each of these vessels plays an important role in the maritime law. While the legal status of the vessel is determined, special attention should be paid to the issue of seaworthiness of the vessel. If the shipowner leases the vessel to another person, the seaworthiness of the vessel must be noted in the contract signed between parties. Unseaworthiness of the vessel cause the responsibility of the contract parties. As can be seen, in the carriage of goods, seaworthiness is one of the main issues that must be regulated in special way. One of the main issues is naming of the vessel. Thus, in the naming of the vessel, different names had been used throughout history. Differentiation of ships has based on both these names and their functions. As noted, the regulation of the process of naming a ship plays a special role in determining the legal status of a ship.

## Bibliography

1. https://en.wikipedia.org/wiki/Ship
2. Merchant Shipping Act,1995
3. Aleka Mandaraka-Sheppard - Modern Admiralty Law with Risk Management Aspects, 2001
4. International Convention for the Safety of Life at Sea (SOLAS)
5. The International Code of Safety for High-Speed Craft (HSC Code)

6. Hassan Salih Khalilieh - Admiralty and Maritime Laws in the Mediterranean Sea, 2006
7. http://maritime-connector.com/wiki/ship-naming-and-launching/
8. George L. Canfield and George W. Dalzell and Jasper Yeates Brinton-The Project Gutenberg EBook of The Law of the Sea, 2016

## Dəniz hüququnda gəminin hüquqi statusu və onun növləri

**Xülasə**

Dəniz yolu ilə malların daşınması xüsusi diqqət tələb edir. Gəminin hüquqi statusunun müəyyən edilməsi dəniz hüququnda əsas məsələlərdən biridir. Gəmilər malların və ya sərnişinlərin dəniz vasitəsilə daşınmasında əhəmiyyətli rol oynayır. İstifadə məqsədindən asılı olaraq gəmilər müxtəlif qruplarda təsnifləşdirilir. Gəmilərin növləri onların quruluşundan, funksiyalarından, ölçüsündən asılı olaraq fərqləndirilir. Gəmilər kimi, onların dənizə yararlılığı da həm dəniz vasitəsilə malların daşınmasında, həm də müqavilə tərəflərinin məsuliyyətinin müəyyən edilməsində əhəmiyyətlidir. Qədim zamanlardan bəri gəminin adlandırılması onların görünüşü, funksiyaları və ya sürəti kimi bir çox şeylərə əsaslanır.

## Правовой статус судна в морском праве и его виды

**Резюме**

Перевозка грузов морем требует особого внимания. Определение правового статуса судна является одним из ключевых вопросов в морском праве. Суда играют важную роль в перевозке грузов или пассажиров морем. Корабли делятся на разные группы в зависимости от цели использования. Типы судов различаются в зависимости от их структуры, функций и размеров. Как и у судов, их пригодность для морских перевозок важна как при морской перевозке грузов, так и при определении ответственности сторон договора. С древних времен название корабля основано на многих вещах, таких как его внешний вид, функции или скорость.

**Rəyçi: dos. F.E.Hüseynova**

Göndərilib: 21.04.2020 Qəbul edilib: 24.04.2020

DOI: 10.36719/AEM/2007-2020/53/90-93

**Nuranə Yusif qızı Yusifova**
Bakı Dövlət Universiteti
nuraneyusif1995@gmail.com

# SEÇKİ HÜQUQU VƏ SEÇKİ SİSTEMİNİN ƏSAS MAHİYYƏTİ

***Açar sözlər:*** *konstitusiya, seçki hüququ, seçki prosesi, legitimlik, xalqın iradəsi*
***Key words:*** *constitution, suffrage, election process, legitimacy, the will of the people*
***Ключевые слова:*** *конституция, избирательное право, процесс выборов легитимность, народная воля*

## Giriş

Bəşəriyyət tarix boyu insan hüquqlarının məhdudlaşdırılmasının qarşısını almaq üçün idarəetmənin böyük bir praktiki prosesini keçmişdir. Bütün dünya dövlətçilik tarixində bu prinsipə əməl etmək üçün müxtəlif tədbirlərə, üsullara müraciət edilmişdir. Seçki məhz həmin üsullardan biridir. Seçkilər əksəriyyətin iradəsini ifadə etmək baxımından hakimiyyəti legitimləşdirir. Seçkilər vasitəsilə xalq öz nümayəndələrini seçir və suveren hüquqlarını həyata keçirmək üçün onlar arasında mandat bölgüsü aparır. Bu yolla insan və vətəndaşın ən mühüm hüquqlarından biri həyata keçirilir. 10 dekabr 1948 - ci il tarixli "Ümumdünya İnsan Hüquqları Bəyannaməsi"ndə qeyd olunduğu kimi, xalqın iradəsi hakimiyyətin əsasını təşkil edir. Məqalədə seçki hüququ və əsas seçki sistemlərinin hüquqi mahiyyətindən bəhs olunmuşdur.

İctimai-siyasi hüquqlar arasında seçki hüququ mühüm və əsas yer tutur. Ona görə ki, vətəndaşların cəmiyyətin və dövlətin siyasi həyatında, dövlətin idarə olunmasında iştirak etməsi, siyasi sistemin formalaşması, dövlət orqanlarının legitimliyi kimi vacib məsələlərin həlli məhz bu hüquqdan asılıdır. Bunu nəzərə alaraq Konstitusiyanın 56-cı maddəsi vətəndaşların seçki hüququnu təsbit edir (1). Seçki hüququ özündə üç əsas və başlıca məsələni əhatə edir:

- Azərbaycan Respublikası vətəndaşlarının referendumda İştirak etmək hüququnu;
- Azərbaycan Respublikası vətəndaşlarının dövlət orqanlarına seçmək hüququnu (vətəndaşların seçmək hüququ);
- Azərbaycan Respublikası vətəndaşlarının seçilmək hüququnu (vətəndaşların seçilmək hüququ).

**Referendumda** (ümumxalq səsverməsində) iştirak etməklə vətəndaşlar dövlət və ictimai həyatın ən mühüm və vacib məsələləri barəsində öz iradələrini bildirirlər. Bununla onlar seçki hüququnu həyata keçirirlər. Referendumda iştirak etmək sözün həqiqi mənasında seçki hüququnu həyata keçirmək deməkdir.

**Vətəndaşların seçmək hüququ** dedikdə, onların prezident seçkilərində. Milli Məclisə (ali nümayəndəli orqana) seçkilərdə iştirak etmək və öz namizədinə səs vermək hüququ- vətəndaşların dövlət orqanlarına seçmək hüququ başa düşülür. Vətəndaşlar yerli özünüidarə orqanlarına (bələdiyyə orqanlarına) seçkilərdə də iştirak edə bilərlər. Vətəndaşların seçmək imkanına aktiv seçki hüququ deyilir. Referendumda iştirak etmək aktiv seçki hüququna aiddir. Azərbaycan Respublikasının vətəndaşları yalnız 18 yaş həddinə çatdıqda aktiv seçki hüququna malik olurlar.

**Vətəndaşların seçilmək hüququ** dedikdə, onların nümayəndəli orqanlara (həm nümayəndəli dövlət orqanına, həm nümayəndəli yerli özünüidarə orqanına), habelə seçkili vəzifəyə seçilmək hüququ başa düşülür. Söhbət vətəndaşların Milli Məclisə deputat, prezident, bələdiyyə üzvü seçilmək hüququndan gedir. Vətəndaşların seçilmək imkanına passiv seçki hüququ deyilir (2, s. 48).

Seçki hüququ qanunla nəzərdə tutulmuş hallarda məhdudlaşdırıla bilər. Bu cür məhdudlaşdırılma ilə bağlı Azərbaycan Respublikası Konstitusiyasının 56-cı maddəsində və müvafiq olaraq Azərbaycan Respublikası Seçki Məcəlləsinin 12, 13 və 14-cü maddələrində konkret əsaslar nəzərdə tutulmuşdur.

Məhkəmənin qərarı ilə fəaliyyət qabiliyyətsizliyi təsdiq olunmuş şəxslər seçkilərdə, habelə referendumda iştirak etmək hüququndan – aktiv seçki hüququndan məhrumdurlar. Məhkəmənin qanuni qüvvəyə minmiş hökmü ilə azadlıqdan məhrumetmə yerlərində cəza çəkən şəxslər, ikili vətəndaşlığı olan Azərbaycan Respublikasının vətəndaşları (ikili vətəndaşlıq aradan qalxanadək), xarici dövlətlər qarşısında öhdəlikləri olan Azərbaycan Respublikasının vətəndaşları (həmin öhdəliklərə xitam verilənədək), ağır və xüsusilə ağır cinayətlərə görə məhkum olunmuş şəxslərin passiv seçki hüququ yoxdur. Hərbi qulluqçular (hərbi qulluqda olduqları müddətdə), hakimlər (hakim olduqları müddətdə), dövlət qulluqçuları (dövlət qulluğunda olduqları müddətdə), din xadimləri (peşəkar dini fəaliyyət ilə məşğul olduqları müddətdə) tutduqları vəzifələrə görə Milli Məclisin deputatı, Prezident, bələdiyyə üzvü ola bilməzlər (3).

Dünya təcrübəsində seçki hüququnun prinsipləri ayrı-ayrı dövlətlərin konstitusiyalarında və müvafiq seçki qanunlarında əks olunmuşdur. Lakin demokratik seçkilər bir neçə ümumi prinsiplərin olmasını nəzərdə

tutur. Seçkilərdə iştirakın prinsiplərinə – ümumi, bərabər, birbaşa seçki hüququ prinsipləri, eləcə də səsvermənin gizliliyi, şəxsi səsvermə, seçkilərdə iştirakın azad və könüllülüyü prinsipləri daxildir.

**Bərabər seçki hüququ prinsipi** Azərbaycan Respublikası Konstitusiyasında təsbit olunmuş bərabərlik hüququna əsaslanır, vətəndaşların seçkilərdə və referendumda bərabər əsaslarla iştirakını nəzərdə tutur. Bu prinsip hər bir seçici üçün seçkilərin nəticələrinə bərabər təsir etmək imkanını müəyyən edir. Hər bir səsvermə zamanı hər bir vətəndaşın bir səsi vardır və hər bir səs eyni hüquqi qüvvəyə malikdir.

**Birbaşa seçki hüququ prinsipi** vətəndaşların seçkilərdə namizədin lehinə, referenduma çıxarılan məsələnin lehinə və ya əleyhinə şəxsən səs verməsi hüququdur. Azərbaycan Respublikası Seçki Məcəlləsində birbaşa olaraq müəyyən edilmişdir ki, başqa şəxslərin yerinə səs vermək qadağandır. Başqalarının əvəzinə səs verən və ya bunun üçün şərait yaradan vətəndaşlar Azərbaycan Respublikası Cinayət Məcəlləsində və ya İnzibati Xətalar Məcəlləsində göstərilən müvafiq məsuliyyətə cəlb olunurlar.

**Səsvermənin gizliliyi prinsipi** səsvermə prosesində kənar şəxslərin müdaxiləsinə yol verilməməsi, şəxsin səsvermə anında ona öz seçimini hamıdan təcrid olunmuş yerdə təkbaşına həyata keçirmək üçün imkan yaradılması, seçicilərin iradəsinin ifadəsi üzərində hər hansı nəzarətin istisna edilməsi hallarını özündə ehtiva edir.

**Şəxsi səsvermə prinsipi** birbaşa seçki hüququ prinsipi ilə sıx bağlı olub, seçkilər zamanı səsvermənin hər bir şəxsin yalnız özü tərəfindən həyata keçirilməsinə icazə verildiyini və bu hüququn həyata keçirilməsinin başqa şəxsə etibar olunmasının mümkünsüzlüyünü nəzərdə tutur.

**Seçkilərdə (referendumda) iştirakın azad və könüllülüyü prinsipi** vətəndaşların seçkilərdə və referendumda iştirakın azad və könüllü olmasını, seçkilərdə (referendumda) iştirak edib-etməməklə bağlı Azərbaycan Respublikası vətəndaşlarına təzyiq göstərilməsinin yolverilməzliyini, heç kəsin vətəndaşın öz iradəsini azad ifadə etməsinə mane olmamasını nəzərdə tutur.

Seçkilər hakimiyyəti legitimləşdirir. Onlar vasitəsilə xalq öz nümayəndələrini müəyyənləşdirir və onlara suveren hüquqlarını həyata keçirmək üçün mandat verir. Beləliklə, mühüm insan və vətəndaş hüquqlarından biri reallaşır. 1948-ci il tarixli Ümumdünya İnsan Hüquqları Bəyannaməsinin 21-ci maddəsinin 3-cü hissəsində qeyd olunur: "Xalqın iradəsi hökumətin hakimiyyətinin əsası olmalıdır, bu iradə öz ifadəsini periodik keçirilən və saxtalaşdırılmayan seçkilərdə tapmalıdır, hansılar ki, ümumi və bərabər seçki hüququ əsasında səsvermə azadlığını təmin edən gizli səsvermə və ya başqa ekvivalent formada həyata keçirilməlidir."

**Seçki sistemi** – seçkilərin keçirilməsi, səsvermənin nəticələrinin müəyyən edilməsi, seçki hüquqlarının həyata keçirilməsi ilə bağlı qaydalar və seçki münasibətlərini tənzimləyən hüquq normalarının məcmusudur. Seçki sisteminin iki əsas növü vardır: majoritar seçki istemi və proporsional seçki sistemi. Majoritar seçki sistemi tarixi planda ən geniş yayılmış, ən çox tətbiq olunan və həm də ən qədim seçki sistemidir. Belə ki, XIX əsrin sonlarına kimi seçki prosesi müstəsna olaraq çoxluq prinsipi əsasında, yəni majoritar sistem əsasında qurulmuşdur. Çoxluq prinsipinə əsaslanan majoritar sistemin («majoritaire» və ya «majorite» fransız sözü olub hərfi mənası «çoxluq» deməkdir) əsas mahiyyəti ondan ibarətdir ki, namizədlərdən qanunla müəyyən olunan çoxluğun səsini toplayan seçilmiş sayılır və mandat əldə edir. Bu seçki sisteminin həm üstün (müsbət) və həm də çatışmayan (mənfi) cəhətləri var. Majoritar sistemin ilk və ən üstün cəhəti onun sadəliyi ilə bağlıdır. Burada iki və ya daha çox turlu mütləq və ya ixtisaslaşmış majoritar sistemlər istisna olmaqla majoritar sistem daha az maliyyə məsrəfi ilə müşayət olunur. Bu sistemin üstün cəhətlərindən birini də müəlliflər daha çox personifikasiya olunması, yəni seçici ilə daha sıx əlaqənin olması və seçicinin məhz kimə səs verəcəyini bilməsi ilə əlaqələndirirlər (4, s. 140). Lakin majoritar sistem bu müsbət cəhətlərlə yanaşı, bunları kölgədə qoya biləcək mənfi cəhətlərdən də xali deyil. Majoritar sistemin əsas, həm də ümumi xarakterli mənfi cəhəti odur ki, burada seçicilərin azlıqda qalan hissəsinin səsi itir və ümumiyyətlə təmsil olunmur. Müsbət cəhəti isə odur ki, burada seçici ilə namizəd arasında birbaşa əlaqə olur, seçici tanıdığı şəxə səs verir. Majoritar sistem qanunverici orqan daxilində regional maraqların qabarması üçün zəmin yaradır. Mütləq majoritar sistemin müsbət cəhəti isə ondan ibarətdir ki, burada seçilən şəxsin arxasında həqiqi sosial baza dayanır və o, çoxluğa söykənir. Onun mənfi cəhəti budur ki, seçkilərə daha çox xərc çəkilir və birinci turda heç də dərhal nəticə əldə olunmur. İkinci turda isə, bir qayda olaraq, birinci tura nisbətən daha az seçici iştirak edir. Odur ki, ikinci turda, adətən, nisbi majoritar sistem tətbiq olunur. Nisbi majoritar sistemdə isə birinci turda nəticə əldə edilir. Bu, onun müsbət cəhətidir. Mənfi cəhəti isə ondan ibarətdir ki, seçilən şəxs bir çox hallarda azlığa söykənir, çoxluğun iradəsini təmsil edə bilmir, yəni sosial bazası zəif olur. Bu səbəblə də bir çox ölkələr qarışıq seçki sistemini tətbiq edir, yəni hər iki sistemi müxtəlif formalarda realizə edir (5, s. 326).

Majoritar sistemə münasibətdə öz üstünlükləri ilə seçilən sistem proporsional seçki sistemidir. Bu sistem majoritar sistemə münasibətdə qütbdə duran bir sistemdir. Majoritar sistemdən fərqli olaraq, proporsional sistem yalnız çoxpartiyalılıq şəraitində tətbiq olunur və çoxpartiyalı siyasi sistemin və siyasi plüralizm

mühitinin formalaşmasına xidmət edir. Majoritar seçki sistemindən fərqli olaraq, burada seçici konkret namizədə deyil, siyasi partiyaların və ya seçki birliklərinin təqdim etdikləri siyahılardan birinə səs verir.

Majoritar sistemdən fərqli olaraq, proporsional sistem demək olar ki, səs itkisinin qarşısını alır. Belə ki, hər bir siyasi partiya səsvermə zamanı topladığı səslərə uyğun olaraq mandat əldə etmiş olur. Proporsional sistem həm də cəmiyyətdə mövcud olan siyasi qüvvələrin bərabər təmsil olunmasına, siyasi maraqların daha tam şəkildə nəzərə alınmasına təminat verir, siyasi təmsilçiliyə şərait yaradır, çoxpartiyalılığın, siyasi plüralizmin, fikir və söz azadlığının inkişafına ciddi təsir göstərir.

Bir məsələni də qeyd etmək lazımdır ki, hüquq ədəbiyyatlarında proporsional sistem müəlliflər tərəfindən əsasən müsbət cəhətlərlə xarakterizə olunur (6, s. 18). Lakin bu müsbət cəhətlərlə yanaşı, bir sıra çatışmazlıqlar da qeyd olunur. Bu əsasən seçkilərdə çoxlu sayda partiyanın iştirakında, nisbətən xırda partiyaların parlamentdə səsvermənin nəticələrinə müvafiq olaraq mandat alması, nəticə etibarilə mandatların parçalanması və har hansı bir böyük partiyanın parlament çoxluğunu qazana bilməməsi və stabil hökumət formalaşdırmaq imkanının məhdudlaşması, seçicilərlə namizədlər arasında birbaşa əlaqənin olmaması və seçicilərin partiyalar tərəfindən tərtib olunmuş namizədlər siyahısına səsverməsi kimi məsələləri əhatə edir ( 7, s. 142).

## Nəticə

Yuxarıda seçki hüququ və seçki sistemləri ilə bağlı əsas məsələlərə toxunuldu. Qeyd olunanları ümumiləşdirərək bu nəticəyə gəlmək olar ki, majoritar seçki sistemi özünün daha çox müsbət cəhətləri ilə xarakterizə olunur. Məhz bu səbəbdən bir çox demokratik ölkələr tərəfindən seçki sisteminin bu növü tətbiq olunur. Seçki prosesi qanunvericilik səviyyəsində Azərbaycan Respublikasının Konstitusiyası və Seçki Məcəlləsi (Azərbaycan Respublikasının 27 may 2003-cü il tarixli, 461-IIQ №-li Qanunu ilə təsdiq edilmişdir) ilə tənzim edilir. Azərbaycan Respublikası Konstitusiyasının 83-cü maddəsinə görə, Azərbaycan Respublikasının Milli Məclisi majoritar seçkilərlə formalaşdırılır. Qanunvericiliyə görə, deputatlar nisbi majoritar seçki sistemi üzrə seçilir.

Lakin onu da nəzərdə saxlayaq ki, Azərbaycan Respublikası Milli Məclisinə seçkilər zamanı majoritar seçki sistemi ilə yanaşı, həm də proporsional seçki sisteminin tətbiqini nəinki məqsədəmüvafiq hesab edirik, bu sistemin tətbiqinin demokratik hüquqi dövlət və vətəndaş cəmiyyəti quruculuğunda bir zərurət olmasını qeyd edirik. Əslində proporsional sistemin çatışmazlıqları kimi xarakterizə olunan məsələlərin əksəriyyəti parlamentli idarəetmə forması üçün xarakterikdir. Azərbaycan Respublikasının idarəetmə formasının prezidentli respublika olmasını, respublikamızın proporsional sistemin tətbiqi ilə bağlı yetərincə qanunvericilik və tətbiqi təcrübəsinin mövcudluğunu, proporsional sistemin ləğvindən sonra yetərincə zamanın keçdiyini və bu zaman çərçivəsində respublikamızın sürətli inkişafını, elmi-texniki tərəqqini, elektoratın intellektual səviyyəsinin yetərincə artdığını, seçki qanunvericiliyinin dünya standartlarının tələblərinə cavab verə biləcək dərəcədə təkmilləşdirilməsini, parlamentarizm elementlərinin inkişafı və çoxpartiyalı sistemin bərqərar olmasını nəzərə alaraq, hesab edirik ki, proporsional seçki sisteminin tətbiq olunmasında hər hansı ciddi maneə yoxdur.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Konstitusiyası. “Hüquq Yayın Evi”, Bakı, 2018. 92 s.
2. Allahverdiyev S.S “Azərbaycan Respublikası Konstitusiyasının və hüququnun əsasları”. Dərslik. Bakı; “Digesta”nəşriyyatı, 2006, 348 s.
3. Azərbaycan Respublikasının Seçki Məcəlləsi //www.e-qanun.az
4. Избирательное право: Учебное пособие. (В.Н.Белоновский и др.), под ред. К.К.Гасанова, В.Н.Белоновского, М.: ЮНИТИ – ДАНА: Закон и право, 2007, 351 с.
5. Əsgərov Z.A. “Konstitusiya hüququ”. Dərslik. Bakı; Bakı Universiteti nəşriyyatı, 2011, 760 s.
6. Nəsirov Elşad “Azərbaycan Respublikası Milli Məclisinə seçkilərin hüquqi tənziminin bəzi problemləri” adlı məqalə // www.publish.bsu.edu.az
7. Сравнительное избирательное право: Учебное пособие. М.: НОРМА, 2003. 208 с
8. www.e-qanun.az
9. www.msk.gov.az

**Main essence of suffrage and electoral system**
**Summary**

Electoral system is one of the main institutions defined in the Constitution of the Republic of Azerbaijan adopted in 1995. The right to vote in democratic states is important as one of the main forms of citizen participation in political governance. For this purpose research of suffrage is of utter importance and in order to resolve the main problems in this sphere of law. This article discusses some of the fundamental problems existing in electoral system.

**Избирательное право и главное значение избирательной системы**
**Резюме**

Избирательная система один из основных институтов определенных в Конституции Азербайджанской Республики. В демократических странах избирательное право являясь формой участия граждан в политическом управлении обладет важным значением. Вследствие, наблюдается необходимость в изучении института выборов и разрешении проблемных вопросов. В данной статье исследуется несколько основных проблем в выборной системе.

**Rəyçi: prof. Ə.Rzayev**

Göndərilib: 23.04.2020 Qəbul edilib: 25.04.2020

DOI: 10.36719/AEM/2007-2020/53/94-97

**Sabuna Firaddin Mammadzada**
Baku State University
mammadzadaa@mail.ru

# DESTRUCTION OF CARGO AS ONE OF THE TYPES OF IMPOSSIBILITY OF PERFORMANCE OF THE CONTRACT OF CARRIAGE OF GOODS BY SEA

***Key words:*** *a contract of carriage of goods by sea, impossibility of performance, destruction of cargo*
***Açar sözlər:*** *dənizlə yük daşınması müqaviləsi, icranın qeyri-mümkün olması, yükün məhv olması*
***Ключевые слова:*** *договор морской перевозки груза, невозможность исполнения, уничтожение груза*

## Introduction

Maritime transport as one of the most important modes of transport plays an important role in the implementation of international economic relations. Sea has been used for centuries in order to carry out various international trade relations, especially transportation activity. Despite the existence of other means of transport such as air, rail and land in modern time, sea transport preserves its significance. According to estimates, it captures the most widely used place for transportation in comparison with the other types of transport due to the features such as being cheaper, eco-friendly, having capacity to carry huge amount of goods and so on. In terms of the subject maritime transport can be divided into two forms: carriage of persons and carriage of cargoes. Today, carriage of goods by sea is particularly necessary as one of the most profitable areas. It is carried out in accordance with the contract of carriage of goods by sea between the parties. In addition to the completion of transportation of goods under this contract, there may also be a number of events such as destruction of cargo that make it impossible to perform the contract. Therefore, the determination of these issues has an importance in this article. Since the restoration of independence of the Republic of Azerbaijan maritime transport has achieved economic independence at the result of a number of changes carried out in the economic, technical, organizational and legal contents of the management of this area. The expansion of international relations carried out by Azerbaijan with foreign countries around the world has had a positive impact on the activities of maritime transport, as in other areas. Taking into account that the Republic of Azerbaijan participates in the international trade relations, also the process of transportation by sea, it can be said that the topic of this article takes a significant place both at national and international level.

The parties of carriage transactions must have a binding agreement for the transportation of goods by sea which creates and regulates rights, obligations and liabilities for them. Principally, the parties of this agreement are a shipper and a carrier. A contract of carriage of goods by sea is agreed for transportation of a bulk or general cargo between the parties. Let's look through how expressed this matter in the national legislation and different conventions.

According to the article 1 of the Hague-Visby Rules "a contract of carriage" applies only to contracts of carriage covered by a bill of lading or any similar document of title, in so far as such document relates to the carriage of goods by sea, from the moment at which such bill of lading or similar document of title regulates the relations between a carrier and a holder of the same [1]. In the Hamburg Rules the article 1 defines that "a contract of carriage by sea" means any contract whereby the carrier undertakes against payment of freight to carry goods by sea from one port to another [2]. In accordance with the Rotterdam Rules "a contract of carriage" means a contract in which a carrier, against the payment of freight, undertakes to carry goods from one place to another [3].

In the legislation of the Republic of Azerbaijan the definition for a contract of carriage of goods by sea is reflected in the article 87 of the Merchant Shipping Code. This article defines that a contract of carriage of cargo by sea is any contract under which a carrier is obliged to transport the cargo (provided or to be provided by the shipper) to the destination port and deliver it to the person authorised to accept the cargo (referred to as a consignee) and payment of the transportation costs (freight) will be borne by the shipper or consignee [4].

As can be seen from the above mentioned provisions a contract of carriage of goods by sea is one under which the carrier undertakes to carry the goods from one place to another and deliver them to the consignee, in return for which the shipper is obliged to pay freight to the carrier. If the parties fulfill these obligations in a safe and efficient manner, the carriage relations between them are satisfied. Consequently, the contract of carriage of goods by sea agreed by the shipper and the carrier is terminated. However, in some cases, unexpected events may occur without any default of either party to the contract, as a result of which the contract

can be automatically terminated. Such a principle is called as frustration of the contract. In the words of Lord Radcliffe, "frustration occurs whenever the law recognises that without default of either party, a contractual obligation has become incapable of being performed because the circumstances in which performance is called for would render it a thing radically different from that which was undertaken by the contract. Non haec in foedera veni. It was not this that I promised to do" [5, p. 38].

One of the types of frustration of the contract of carriage of goods by sea is impossibility of performance. So, such an event may occur without neglect or fault of any party to the contract that it makes the situation radically different from that which has been agreed under the contract by the parties. At the result of impossibility of performance the parties are discharged from their obligations and the contract of carriage of goods by sea will be automatically terminated. This matter is also reflected in the article 556 of the Civil Code of the Azerbaijan Republic. This article defines that in the event, it is impossible to perform the obligation, namely when the non-performance results from a case, when neither of the parties is responsible, the obligation shall be terminated [6].

It is important to identify the events that make it impossible to perform a contract of carriage of goods by sea. These events may include destruction of the ship, capture of the ship by force, consideration of the ship unfit for sea navigation, destruction of the cargo established in accordance with its individual properties and so on [7, p. 209]. The article 121 of the Merchant Shipping Code clarifies them and notes that the contract will be terminated upon execution of the contract of carriage of goods by sea and before the departure of the ship from the port of loading for the reasons not depending upon the parties without the liability of compensation for the other party for the losses in connection with termination of the contract as follows:

- if the ship is destroyed or captured by force;
- if the ship is deemed unfit for sea navigation;
- ruin of the cargo established in accordance with its individual properties;
- in case that a cargo identified in accordance with the brand features is ruined upon delivery for loading and the shipper does not timely hand over any other cargo instead of the ruined cargo [4].

Accordingly, destruction of cargo which one must be carried or being in carriage under a contract of carriage of goods by sea can result with impossibility of performance of it. This case must not be depended on fault or neglect of either party. Otherwise, either party may be liable for loss of or damage to goods, unless this party proves that the event has not occurred for the reason of his fault or neglect.

Ruin of cargoes can be in various forms, for instance: their stealing, burning, spoiling, rusting, freezing and other cases that lead to loss or reducing of economic value of goods. As the purpose of the contract of carriage of goods by sea is transportation of certain cargoes, carriage of the destructed goods will not have significance for the parties. Therefore, it is important to determine destruction of cargo as one of the types of impossibility of performance of this contract.

Destruction of cargo can be looked through in two aspects for the ground of the time of occurence: before and after departure of the ship from the loading port. Before looking through the first aspect, it is necessary to determine kinds of cargo such as non-substitutable and substitutable. Because the conditions for delivery for carriage by the shipper may vary depending on what kind of cargo agreed to be transported. Definitions of such types of goods are reflected in the article 135.7 of the Civil Code. It notes that non-substitutable tangible objects are individually defined objects which are distinguishable from other goods because of their specific features. Movable property distinguishable by typical features and usually defined in turnover by quantity, size or weight is a substitutable object [6]. So, as the goods distinguished by specific features cannot be changed with exactly same others they are called as non-substitutable cargo. Because it is impossible to find the other with the feature of being completely same with the goods must be carried. However, substitutable goods are different. As they are defined in reference to typical features such as quantity, weight, size and etc. of contracted - for goods of a certain class (rather than a single object) they can be substituted with the same ones. This feature of substitutable goods is defined as "genus non perit" in Roman law [8, p.106].

If the cargoes described with specific features in the agreement between the parties have been ruined without fault of either party before departure of the ship from the loading port, the contract of carriage of goods by sea will be automatically terminated without obligation to compensate each other. This event is mentioned as one of the grounds for impossibility of performance of the contract in the article 121.1.3 of the Merchant Shipping Code such as "ruin of the cargo established in accordance with its individual properties" [4]. In this case, performance of the contract will be impossible because the destructed cargo is non-substitutable object and another one cannot be provided instead of it. If the shipper wants to deliver other goods instead of the destructed specific cargo then a new contract of carriage of goods must be agreed by the parties in order to carry them [8, p.107].

In the other case that if cargo has been described with the general features in reference to kind or class of goods in the agreement by the parties, it is important to know how a contract of carriage of goods by sea will result after ruin of this cargo. If the substitutable cargo has been destroyed as a result of reasons beyond the control of any party after delivery for carriage to the carrier before departure of the ship from the loading port, performance of the contract can be impossible, therefore, it can be terminated without compensation. But the shipper may provide the carrier with the other cargo in same quantity or other feature. In this case, the contract of carriage of goods by sea will not be terminated. This matter is noted in the article 121.1.4 of the Merchant Shipping Code such as in case that a cargo identified in accordance with the brand features is ruined upon delivery for loading and the shipper does not timely hand over any other cargo instead of the ruined cargo [4]. The shipper must give the notice that he is ready to deliver the new goods and start to load these goods during the time considered for loading of the cargo called as lay time. According to the article 97 of this Code lay time is the period when the carrier brings up for loading and keeps the ship under the load without extra payment for freight [4]. But the shipper must not impede the carrier by loading of new ones instead of destructed goods. The shipper must deliver to load the other goods as soon as possible and bear the additional expenses, furthermore if the waiting time for the completion of the loading extends and the carrier is damaged as a result, the shipper must compensate it [9, p.243]. The article 98 of the Shipping Merchant Code determines this period such as demurrage - upon completion of the lay time additional waiting period. According to the article 99 of this Code amount of the costs to be paid to carrier for the ship demurrage period (delay) will be defined with the mutual consent of the parties [4]. Consequently, if the shipper follows these terms, the contract of carriage of goods by sea remains in force, otherwise it will be automatically terminated.

Let’s look through destruction of cargo which occurs before the delivery for carriage. If the intended cargo is destroyed before shipment, there is usually no frustration since it is normally possible for the shipper to obtain a substitute cargo of the same type [10, p.370]. Thus, if the shipper has not delivered cargoes for carriage and they have been destructed, this event does not influence to the result of the contract because these cargoes are considered as in possession of the shipper. The shipper can waive from performance of the contract by compensation to the carrier if he cannot use to substitute the destroyed goods with new ones. This situation is also reflected in the article 529.8 of the Civil Code such as payment of compensation instead of performance of the obligation under the agreement between the parties, may terminate the obligation [6].

Partially destruction of cargoes before departure of the ship from the loading port does not result with termination of the contract. In this case, the shipper can choose one of two ways: to load new cargo instead of the destructed part of the goods and to waive from performance of the contract by compensating [8, p.109-110]. If the shipper chooses the first way, it must not make difficult the situation for the carrier and the shipper must pay extra expenses for loading of new goods. The article 119 of the Merchant Shipping Code notes that the shipper will be authorised to waive from execution of contract, on conditions of payment of all costs incurred by the carrier in connection with the execution of this contract, demurrage costs and or freight or part of it [4]. As can be seen if the shipper chooses the second way, he must compensate the carrier.

Let’s look through the second aspect of destrution of cargo which occurs after departure of the ship from the loading port. The article 121.2 of the Merchant Shipping Code defines that in accordance with the article 121.1 of this Code, contract of carriage of goods by sea might also be terminated during sailing [4].

If whole cargo have been destroyed after the time of leaving of the ship from the loading port, the contract of carriage of goods by sea will be automatically terminated without compensation. Contrary, unless there is the term about it between the parties, the shipper will not be obliged to pay freight for the destructed cargo and if freight has been paid before, it must be returned. Otherwise, if the parties have agreed to pay freight in case of destruction of the goods, the shipper must pay freight although the contract cannot be performed [8, p.113].

Destruction of some parts of the cargoes being in carriage does not influence the contract. It can be possible to perform the contract with the other safe parts of the goods. According to the article 121.2 of the Merchant Shipping Code in this case the carrier depending upon the amount the salvaged cargo and freight handed over, will be delivered in an amount proportionate to actual transportation distance [4]. Consequently, the shipper must pay the freight to the carrier for the delivered goods in accordance with the actual distance of carriage.

## Conclusion

Transportation of cargo is carried out on the basis of a contract of carriage of goods by sea. In some cases, destruction of cargo may result with the impossibility of performance of this contract. Therefore, it is important to determine these cases in accordance with the doctrine and legislation. In order to consider the performance of the contract impossible, the event of ruin of cargo must be unexpected and not be depending upon any neglect or fault of either party to the contract. As a result, the parties are discharged from their obligations such as compensation. The results of impossibility of performance of the contract of carriage of goods by sea can range due to the cases for destruction of cargo depending on being completely or partially, the time of occurrence such as before and after the departure of the ship from the loading port, determination of cargo such as non-substitutable or substitutable in the contract and so on.

## Literature

1. The Hague-Visby Rules - The Hague Rules as Amended by the Brussels Protocol, 23 February, 1968;
2. United Nations Convention on the Carriage of Goods by Sea, ("Hamburg Rules"), 1978, https://unctad.org/en/PublicationsLibrary/aconf89d13_en.pdf ;
3. United Nations Convention on Contracts for the International Carriage of Goods Wholly or Partly by Sea, (Rotterdam Rules),2008, http://www.uncitral.org/pdf/english/texts/transport/rotterdam_rules/Rotterdam-Rules-E.pdf;
4. Azərbaycan Respublikasının Ticarət Gəmiçiliyi Məcəlləsi, http://www.e-qanun.az/code/16;
5. John F Wilson, Carriage of Goods by Sea, seventh edition, 2010, p.559;
6. Azərbaycan Respublikasının Mülki Məcəlləsi, http://www.e-qanun.az/code/8;
7. Prof.S.S.Allahverdiyev, Nəqliyyat Müqavilələri, 1-ci hissə, "Digesta" nəşriyyatı, Bakı, 2005, s.335;
8. Dr. Mertol Can, Navlun Sözleşmesinin Sona Ermesi, Ankara, 1998, s.216;
9. Prof.Dr.Rayeğan Kender, Prof.Dr.Ergon Çetingil, Prof.Dr.Emine Yazıcıoğlu, Deniz Ticaret Hukuku-temel bilgiler, cilt 1, İstanbul, s.400;
10. Richard Williams, Gard Guidance on Maritime Claims and Insurance, 2013, p.594

## Yükün məhv olması dənizlə yük daşınması müqaviləsinin icrasının qeyri-mümkün olmasının növlərindən biri kimi

### Xülasə

Dəniz yolu ilə nəqliyyat milli və beynəlxalq səviyyədə iqtisadi, xüsusilə də ticarət münasibətlərinin həyata keçirilməsində mühüm rol oynayır. Dənizlə yüklərin nəql edilməsi üçün tərəflər, yəni yükgöndərən və daşıyıcı dənizlə yük daşınması müqaviləsi bağlamalıdır. Məqalədə bu müqavilənin anlayışı barədə milli qanunvericiliyin və beynəlxalq konvensiyaların müddəaları nəzərdən keçirilir və onun əhəmiyyəti qeyd olunur. Elə hadisələr ola bilər ki, onların baş verməsi nəticəsində dənizlə yük daşınması müqaviləsinin icrası qeyri-mümkün olar. Bu səbəbdən müqavilə xitam oluna bilər. Məqalədə müqavilədə daşınması nəzərdə tutulmuş yükün məhv olması bu hallardan biri kimi nəzərdən keçirilir, onun baş vermə zamanı, yükün növü və sair cəhətlərə görə fərqli nəticələri təhlil olunur.

## Уничтожение груза как один из невозможных способов исполнения договора о морской перевозки

### Резюме

Морские перевозки играют важную роль в реализации экономических, в особенности, торговых отношений на национальном и международном уровнях. Для перевозки товаров морским путем стороны, то есть грузоотправитель и перевозчик, должны заключить договор. В статье рассматриваются положения национального законодательства и международных конвенций по определению этого соглашения и подчеркивается его важность. Могут возникнуть события, которые впоследствии повлияют на невозможность исполнения договора о морской перевозки. По этой причине договор может быть расторгнут. В статье рассматривается уничтожение груза, подлежащего перевозке в договоре, как один из этих случаев, анализируются последствия его возникновения, в зависимости от типа груза и других аспектов.

**Rəyçi: h.f.d. S.Ə.Eyvazova**

Göndərilib: 25.04.2020 Qəbul edilib: 27.04.2020

DOI: 10.36719/AEM/2007-2020/53/98-103

**Mətləb Sahib oğlu Məmmədzadə**
Milli Aviasiya Akademiyası
matlabmammadzadeh@gmail.com

# QANUNİ SAHİBKARLIQ (KOMMERSİYA) FƏALİYYƏTİNƏ MANE OLMA CİNAYƏTİNDƏ VƏZİFƏLİ ŞƏXSLƏRİN ROLU

***Açar sözlər:*** *sahibkarlıq fəaliyyəti, vəzifəli şəxslər, iqtisadi fəaliyyət, qanuni sahibkarlıq*
***Key words:*** *entrepreneurial activity, officials, economic activity, legal entrepreneurship*
***Ключевые слова:*** *предпринимательская деятельность, чиновники, хозяйственная деятельность, легальное предпринимательство*

## Giriş

Şəxsiyyətin, onun hüquq va azadlıqlarının, eləcə də mülkiyyətinin cinayətkar qəsdlərdən qorunması Azərbaycan Respublikasında qüvvədə olan Cinayət Məcəlləsinin əsas vəzifələrindən biri kimi müəyyən edilmişdir. Müstəqillik dövründə yeni iqtisadi münasibətlərin yarandığı, inkişaf etdiyi bir şəraitdə iqtisadi fəaliyyət sahəsində yaranan (formalaşan) ictimai münasibətlərin kriminallaşması təhlükəsi reallığa çevrilmiş, mütəşəkkil cinayətkarlıq və korrupsiya inkişaf etmiş, cinayətkar elementlərin hakimiyyət orqanlarına daxil olmaq təhlükəsi yaranmışdır. Azərbaycan Respublikasının 1999-cu ildə qəbul edilən yeni Cinayət Məcəlləsində iqtisadi sahədə yaranan ictimai münasibətlər hüquqi cəhətdən dövlətin mühafizəsinə götürülmüşdür (24-cü fəsil, 190-213-cü maddələr). İqtisadi fəaliyyət sahəsində olan cinayətlərin məsuliyyətini müəyyən edən cinayət-hüquqi normaların müəyyən edilməsinin məqsədi dövlətin iqtisai siyasətinin həyata keçirilməsinin təmin edilməsindən ibarətdir.

Ölkəmizin cinayət qanunvericiliyində qanuni sahibkarlıq fəaliyyətinə mane olma maddəsi bazar iqtisadiyyatının mühüm prinsiplərindən olan təsərrüfat plüralizminin, sahibkarlıq azadlığının, təşkilati-hüquqi və mülkiyyət formasına fərq qoyulmadan ölkəmizdə olan hər bir sahibkarlıq fəaliyyəti subyektinin bərabərliyinin təminatlarından biridir.

Azərbaycan Respublikası Konstitusiyası hər kəsin azad sahibkarlıq fəaliyyətinə və ya qanunla qadağan edilməyən digər iqtisadi fəaliyyət növü ilə məşğul olmasına təminat verir [1, 20]. Mülki Məcəllənin məqsəd və vəzifələrindən biri də sahibkarlıq fəaliyyətini dəstəkləməkdir. Həmin məcəllənin prinsiplərindən biri mülki hüquq subyektlərinin iradə sərbəstliyi, başqa sözlə desək, mülki dövriyyə iştirakçılarının qanuni fəaliyyətinə hər hansı formada müdaxilə etmənin yolverilməzliyidir [2, maddə1].

Sahibkarlıq (kommersiya) fəaliyyəti ilə təşkilati-hüquqi və mülkiyyət formasına fərq qoyulmadan, sahibkarlıq fəaliyyətindən asılı olmayaraq sahibkarlıq fəaliyyətinin bütün iştirakçıları bərabər hüquqlardan istifadə edir və qanunla müəyyən edildiyi kimi, sahibkarlıq fəaliyyəti ilə həm fərdi sahibkar kimi, eləcə də hüquqi şəxs yaradaraq məşğul olmaq olar.

Sahibkarlıq (kommersiya) fəaliyyəti fiziki və ya hüquqi şəxsin müstəqil surətdə (sərbəst) həyata keçirdiyi, əsas məqsədinə əmlak istifadəsi, əmtəə satışı, işlər görülməsi və ya xidmətlər göstərilməsi ilə mənfəət (gəlir) götürülən fəaliyyətdir. Belə fəaliyyət əmlakın icarəyə verilməsi, əmtəələrin istehsalı və satışı, nəqliyyat, tibb, rabitə, turizm, auditor, məsləhət və s. xidmətlərin göstərilməsi, habelə qanunla qadağan edilməyən başqa fəaliyyət ilə ifadə oluna bilər [3, 45]

Sahibkarlıq fəaliyyəti sahibkarlığın ümumi prinsiplərini, sahibkarlıq fəaliyyəti subyektlərinin hüquq və vəzifələrini, sahibkarın dövlət orqanları ilə qarşılıqlı münasibətlərini müəyyən edir. Mülkiyyətin ümumi formalarının bərabərliyi prinsipinin reallaşdırılması, müstəqil şəkildə fəaliyyət sahələrinin seçilməsi, iqtisadi qərarların qəbul olunması əsasında iqtisadi təşəbbüsün, işgüzarlığın geniş təzahürü üçün şərait təşkil edilməsi sahibkarlıq fəaliyyətini xarakterizə edən vacib cəhətlərdəndir. Sahibkarlıq fəaliyyəti, hüquqi və fiziki şəxslərin mənfəət və yaxud şəxsi gəlir (mənfəət) əldə olunması məqsədilə özlərinin əmlak məsuliyyəti və cavabdehliyi ilə va ya başqa hüquqi və yaxud fiziki şəxslərin adından qanunvericilikdə qadağan olunmayan təsərrüfat fəaliyyətinin növləri, həmçinin, məhsulun istehsalı, satışı, xidmətlər göstərilməsi formasında reallaşdırdıqları müstəqil təşəbbüskarlıq fəaliyyətidir. Sahibkarlıq ilə əlaqədar münasibətlər fəaliyyət növündən və sahəsindən, mülkiyyət formasından asılı olmayaraq beynəlxalq hüquqi öhdəliklər ilə tənzimlənir.

Sahibkarlığın subyektləri:

1. Azərbaycan Respublikasının fəaliyyət qabiliyyətli vətəndaşı;
2. mülkiyyət formasına fərq qoyulmadan hüquqi şəxslər;

## FƏLSƏFƏ VƏ SOSİOLOGİYA PHILOSOPHY AND SOCIOLOGY ФИЛОСОФИЯ И СОЦИОЛОГИЯ

DOI: 10.36719/AEM/2007-2020/53/151-155

**Rafail Ayvaz oğlu Əhmədli**
AMEA-nın Fəlsəfə institutu
ehmedli.rafail@mail.ru

# XIX ƏSRDƏ AZƏRBAYCANDA MİLLİ ŞÜURUN İNKİŞAFINA ABBASQULU AĞA BAKIXANOVUN VƏ QASIM BƏY ZAKİRİN SOSİAL-SİYASİ GÖRÜŞLƏRİNİN TƏSİRİ

**Açar sozler:** *milli şüur, milli özünüdərk, Abbasqulu Ağa Bakıxanov, Qasım bəy Zakir, maarifçilər*
***Key words***: *national thinking, national identity, Abbasgulu Aga Bakikhanov, Gasim bei Zakir, enlighteners*
***Ключевые слова***: *национальное мышление, национнальное самосознание, Аббасгулу Ага Бакиханов, Гасым бей Закир, просветители*

XIX əsrin əvvəllərində Azərbaycan xanlıqlarının müstəq=illiklərinin əlindən alınması xalqın milli şüurunun inkişafına əngəllər törətməklə yanaşı, ictimai-siyasi fikirdə milli özünüdərkin tərəqqisi üçün də buxova çevrilmiş, russayağı düşünməyi və onun mövqeyindən çıxış etməyi tələb etmişdi.

Belə bir ağır və mürəkkəb vəziyyət Azərbaycanın yaradıcı ziyalılarını düşündürməyə bilməzdi. Məsələnin ziddiyyətli məqamı ondan ibarət idi ki, bu ziyalılarımızın bəzisi xalqın maddi, sosial-siyasi və iqtisadi vəziyyətinin səbəbini çar Rusiyasının iyrənc müstəmləkəçilik siyasətində deyil, feodalizm quruluşunun qüsurlarında, xüsusilə, dini-fanatizmdə və intellektual gerilikdə görürdülər. Lakin xalqımızın qabaqcıl ziyalıları olan Qasım bəy Zakir, Mirzə Şəfi Vazeh, Mirzə Kazım bəy və Abbasqulu Ağa Bakıxanov kimi XIX əsrin birinci yarısında fəaliyyət göstərən mütəfəkkirlər xalqın mövcud vəziyyətini məhdud mənada deyil, geniş sosial-siyasi anlamda başa düşür və öz yaradıcılıqlarında ciddi problemlərə toxunmaqdan çəkinmirdilər. Bu düşünürlərdən biri və birincisi də məhz Abbasqulu Ağa Bakıxanovdur.

***Abbasqulu Ağa Bakıxanovun*** dünyagörüşünün formalaşması Quzey Azərbaycanın ən ağır və son dərəcə ziddiyyətli bir dövrünə təsadüf edir. Onun sosial-siyasi görüşlərində dövrünün haqsızlıqlarından narazılıq əsasən bədbinlik ruhunda olsa da, o, haqqın və ədalətin qalib gələcəyinə dərin inam bəsləmişdir. Onun sosial-siyasi ideyalarında feodalizm quruluşunun sosial mənzərəsi bilavasitə özünün şəxsi münasibəti ilə bağlıdır. O, yaşadığı cəmiyyətin çətinlik və ağırlıqlarını, xalqının psixoloji aləmini, onların həyata baxışlarını, ona münasibətini dərindən anlamış, sosial çətinliklərə sağlam yanaşmış, ictimai bəlaların aradan qaldırılmasını xalqın maariflənməsində görmüşdü.

Mütəfəkkirin fikrincə, xalqın əməyi hesabına varlanıb xüsusi imtiyaz daşıyıcılarının maddi və mənəvi rahatlığını təmin edən çirkaba batmış, siyasi quruluşun ədaləti və mərhəməti olmaz. Müəllifin sosial-siyasi düşüncəsi əsasən xalqın ağır vəziyyətini yüngülləşdirməyə xidmət edirdi. Onun fikrincə, cəmiyyətdə haqsızlıqlar yaradan səbəblərdən biri məhz həmin cəmiyyətin yüksək təbəqələrinin varlanmaq ehtirası, acgözlülüyü, var-dövlət yığmaq hərisliyi, tamahkarlığı və tüfeyliliyidir. Əxlaqa və ədalətə zidd olan belə qeyri-insani, eybəcər və rəzil keyfiyyətlər insanları bir-birini didib-parçalamağa sövq edir, cəmiyyəti fəlakətə sürükləyir.

Bakıxanov cəmiyyətin rahatlığını insanların yaxşı niyyətli əməllərində və onların arasındakı qarşılıqlı xoş niyyətlərdə görürdü. O, "Hind əfsanəsi" adlı əsərində yazırdı: "Rahatlıq mal-dövlət və vəzifədə deyil, vəziyyətin yaxşılığındadır. Çox vaxt olmuşdur ki, bir kasıb bir tikə çörək tapıb, sakit və şadlıqla yeyib, amma var-dövlət və cah-cəlal sahibləri öz işlərinin dolaşdığı üzündən təşviş və möhnət içində yaşayıblar. Mala, var-dövlətə, sərvətə aludəlik insanları faydalı işlər görməkdən çəkindirir, onları yaxşı əməllərdən uzaqlaşdıraraq şər əməllər törətməyə sövq edir ki, belə vəziyyət cəmiyyəti natəmizliyə, mənəvi şikəstliyə sürükləyir, başqa-başqa naqis hərəkətlər törətməyə yuvarlandırır". Buna görə də, müəllif insanları, xüsusilə gəncləri gözü dünya malında olanlardan uzaq durmağa çağırır və göstərirdi ki, dünya malını sevən və yüksək vəzifəyə həris olan adam dostluğa yaramaz, çünki elə insanlar həmişə öz xeyrini güdüb başqalarına ziyan verməyə çalışarlar (7).

Tədqiqatçılar göstərirlər ki, Bakıxanovun müasiri olduğu feodalizm quruluşundan və onun haqsızlıqlarından narazılığı, həm də məzlum və əzabkeş xalqın qorunmayan mənafelərini müdafiə edən sosial-siyasi

motivlər olduğundan məhz xalqın mənafelərinin müdafiəsi baxımından həmin narazılıq və etirazları həm də ümumbəşəri xarakter daşıyırdı. Böyük mütəfəkkiri, hər şeydən əvvəl, mənsub olduğu xalqın taleyi, Vətənin düşdüyü acınacaqlı vəziyyət düşündürürdü. Doğrudur, Azərbaycan xalqının zorla iki hissəyə parçalanması nəticəsində ölkənin şimal hissəsinin Çar Rusiyasının köləsinə çevrilməsinə bir çar məmuru olaraq münasibətdə onun mövqeyinin qeyri-müəyyənliyi düşdüyü tarixi şəraitdən irəli gələn bir hal kimi qiymətləndirmək olar. Çünki həmin dövrdə Rusiyada kapitalist istehsal münasibətlərinin inkişafı sonradan bir çox xalqların həbsxanasına çevrilərək imperiyanın iqtisadi və siyasi cəhətdən irəliləyəcəyi ümidlərini verirdi. Buna nə dərəcədə əmin olub-olmadığı Bakıxanovun bizə məlum olmayan siyasi mövqeyindəki qeyri-ardıcıllıq, şübhəsiz ki, baş verəcək irəliləyişə inamından irəli gəlirdi. Lakin bu imperiyanın sonralar öz tərkibinə qatdığı xalqların başına gətirdiyi bəlaları həmin tarixi şəraitdə və mühitdə görmək hələ mümkün deyildi (7).

Xalq onu öz ideologiyasının müti qulu etməyə çalışan və buna mərhələ-mərhələ nail olan Çar Rusiyasının qanunları ilə yaşamaq istəmir, ona müxtəlif yollarla öz etirazını bildirirdi. Bakıxanov əgər yaradıcılığının ilk illərində Azərbaycanın quzeyinin Rusiya İmperiyasının tərkibinə daxil olmasını müsbət qiymətləndirirdisə, sonralar rus çarizminin Azərbaycanda yeritdiyi müstəmləkə siyasətinin zərərli olduğunu dərk etmiş, hökumətin bir sıra yüksək vəzifəli şəxslərinə göndərdiyi məlumatlarda onları inandırmağa çalışırdı ki, onların Azərbaycan xalqına qarşı yürütdüyü antihumanist siyasəti yolverilməzdir.

Bəllidir ki, Çar Rusiyası müxtəlif ölkələrdə yaşayan xristian hayları kütləvi şəkildə zəbt etdiyi Quzey Azərbaycanın ən səfalı və məhsuldar ərazilərində yerləşdirərək özünə dayaq yaratmağa başlamışdı. Bakıxanov çar hakimiyyəti tərəfindən ermənilərin və erməni Qriqoryan kilsəsinin Azərbaycan xalqı əleyhinə siyasi fitnəkarlığının müdafiə olunduğunu öz kəskin siyasi problemlərə həsr etdiyi məlumatlarında açıq şəkildə ifşa etmiş, Çar Rusiyasının yüksək vəzifəli məmurlarını inandırmağa çalışmışdı ki, bütün bunlar şovinist ermənilərin dəyirmanına su tökməkdən başqa bir şey deyildir.

Abbasqulu Ağa Bakıxanovun sosial-siyasi ideyalarının təhlili göstərir ki, o, feodalizm quruluşunun nöqsanlarını olduğu kimi göstərmiş, elmi yaradıcılığında olduğu kimi sosial-siyasi ideyalarında da yaşadığı cəmiyyətin ictimai-siyasi həyatının bütün sahələrinə nüfuz etməyə çalışmış, cəmiyyətin çatışmazlıqları və ədalətsizlikləri ilə heç vaxt barışmamış, insanların qeyri-bərabərliyinə və hüquqsuzluğuna qarşı çıxmaqdan çəkinməmişdir.

XIX əsr Azərbaycan milli şüurunun formalaşmasında xalq üsyanları, Qaçaq hərəkatları və dini-əxlaqi ideyalarla yanaşı, Abbasqulu Ağa Bakıxanovla birlikdə Qasım bəy Zakirin də sosial-siyasi ideyaları mühüm rol oynamışdı.

***Qasım bəy Zakir*** dövrün ictimai-siyasi hadisələrinə öz tənqidi münasibətini bildirmiş, səlahiyyət sahiblərinin əxlaq və rəftarını, dövrün eybəcərliklərini kəskin şəkildə öz satiralarında ifşa etmişdi. Satirik şair gözü önündə cərəyan edən hadisələrə biganə qalmamış, ədalətsizliklərin aradan qaldırılmasına çalışmış, bu yolda xeyli maneələrlə qarşılaşmışdı.

Tədqiqatçılar göstərirlər ki, Zakirin "satiralarında özündən əvvəlki ənənəvi inqilabi inkarı yoxdur, irsin təkamülü ideyası var ki, bu ideya birbaşa milli şüurun formalaşmasına xidmət edən amildir... Realist satirada hər şey – Zakirdə öz təbii məntiqi yekununa çatır. Yerli məmurlar, bəy və tacirlər, müstəmləkə rejimi, onun konkret imkanları burada adı və soyadı ilə verilsə də, bu təfsilat onun yaradıcılığında qanunauyğunluq, həcm isə satira səviyyəsində ümumiləşə bilir" (6).

Xalq və millət anlayışı Azərbaycan milli şüurunun formalaşmasında əsas rol oynadığından Qasım bəy Zakirin satiraları ilə həmahəng səslənirdi. Şairin satiralarının əsas tənqid hədəfi İslamı məzhəb və təriqətlərə ayıran, onu formal ibadət səviyyəsinə endirən, İslam dininin əxlaq anlayışını saxta ehkam və xurafat səviyyəsinə düşürən, şəriət məhkəmələrini açıq aşkar soyğunçuluq vasitəsinə çevirən ikiüzlü ruhanilər, vaizlər, tüfeyli mülkədar, xan, bəy, tacir, baqqal, darğa, kvartal və çar məmurları idi.

"...Üləmalar üz döndərib xudadən,
Usanmaz bir ləhzə cövrü cəfadən.
...Birindən şikayət edəsən əgər,
Danışanda qoymaz, sözünü kəsər.
Qardaş malı kimi ortadan bölər,
Murovlar olublar oğruya ortaq" (3, 22).

və ya:

...Gecə get cibinə beş-on manat sal,
Gündüz gəlib nırxı-bəhayə bir bax!" (3, 35).

Qasım bəy Zakir Azərbaycan bədii dilini yeni mərhələyə qaldıraraq məzmunca dolğun, formaca bitkin satirik şeirləri, qoşmaları, gəraylıları ilə həməsri olduğu şair və yazıçılardan fərqlənmiş, ustad bir sənətkar

kimi ad qazanmışdır. XIX əsrin birinci yarısında Quzey Azərbaycanda mili şüurun formalaşmasında, sosial-siyasi intibahın oyanmasında, milli dilin saflaşmasında Qasım bəy Zakirin əvəzsiz xidmətləri olmuşdur. Onun ictimai məzmunlu şeirləri Azərbaycan milli düşüncəsinin formalaşmasında xüsusi rol oynamışdı 4, .

Azərbaycan ədəbiyyatında realizmin formalaşması və inkişafında mühüm rol oynayan Zakirin dərin məzmuna malik satiralarında şair Azərbaycan həyatını geniş lövhələrlə əks etdirmiş, dövrün mühüm sosial-siyasi məsələlərinin tipik cəhətlərini ümumiləşdirmiş, feodal üsul-idarəsinin nöqsanlarını açıb göstərmişdir. Sənətkar feodal-patriarxal münasibətlərin hökm sürdüyü cəmiyyətin çürüməyə başlayan qayda-qanunları, istismarçı təbəqələrin əxlaq və rəftarını, bir sözlə, həyatda gördüyü bütün qüsur və nöqsanları cəsarətlə ifşa etmişdi. Onun amansız həcvindən, acı gülüşlərindən nə bəy, nə xan, nə mülkədar, nə tacir, nə ikiüzlü din xadimləri, nə tüfeyli mülkədar, nə darğa, nə kvartal və nə də çar məmurları yaxalarını qurtara bilməmişdi.

Həyatın vacib məsələlərinə, sosial-siyasi və ictimai ziddiyyətlərinə həsr olunmuş şeirlərində Zakirin dərdi, kədəri aid olduğu xalqın dərdi, kədəri idi. Onun şeirlərində ictimai kədər, ədalətsiz cəmiyyətdən narazılıq hissi çox qüvvətlidir. Onun şeirləri sosial-siyasi haqsızlıqlara qarşı xalq şüurunda güclənən tənqidi münasibətdən, xalq yaradıcılığının realist və satirik məzmunundan qidalanmışdı.

Zakir əsərlərinin əsas tənqid hədəfi onun yaşadığı ictimai mühitdəki haqsızlıq, özbaşınalılıq və imtiyazlı hakim təbəqələrdir. O, "Şərin kökü"nü özünü ölkənin ağası hesab edən çar məmurlarında, onlara havadarlıq edən alçaq təbiətli yerli bəylərdə və yaltaq, ikiüzlü ruhanilərdə görürdü. Şair, Mirzə Fətəli Axundova, İsmayıl bəy Qutqaşınlıya, Baba bəy Şakirə, Məhəmməd bəy Cavanşir Zəngilaniyə və Şamaxı vilayətinin rəisi M.P.Kolyubakinə yazdığı məktublarında, eləcə də ayrı-ayrı satirik şeirlərində sosial siyasi və ictimai məsələlər – zülmün, özbaşınalıq və haqsızlığın kəskin tənqidi, vətən və xalq məhəbbəti əsas yer tutur. Bu məktublarda ölkəni idarə edənlərin, hakim feodal qüvvələrin əxlaq və rəftarı kəskin tənqid olunur.

Xalqını, vətənini dərin məhəbbətlə sevdiyi üçün tüfeyli həyat sürənlərə, xalqın əməyi ilə varlanıb eyş-işrətlə yaşayanlara şair dərin nifrət bəsləyirdi. O dövrdə Qarabağ bəylərinin bir hissəsi rəiyyətin, rəncbərin hesabına yaşayır, gecə-gündüz vaxtlarını eyş-işrətdə keçirir, zəhmətkeş xalqla ədalətsiz rəftar edirdilər. Zakir isə bəy olmasına baxmayaraq rəiyyətlə birlikdə yer şumlayır, əkin əkir, bağ becərir, qoyun qırxır, onlarla birlikdə bir süfrədə çörək yeyir, onların dərdinə qalırdı. Onun kəndlilərlə dilbir olması, bəzi məsələlərdə onları ayıq salması yerli bəylərin mənafeyinə toxunduğundan illər ötdükcə onun düşmənləri də artmışdı. O dövrdə Qarabağın tanınmış bəylərindən sayılan şair Səfərqulu xan Nəva və gününü yaltaqlıqla, qulluqbazlıqla keçirən Hüseyn bəy Zakirə düşmən münasibət bəsləyirdilər. Zakir əvvəllər şair Səfərqulu xan Nəva (Aşıq) ilə yaxın olmuş, lakin bir müddətdən sonra onun yaramaz hərəkətlərini görüb ondan üz döndərmiş, şeirlərində onun zəhmətkeş kəndliləri incitdiyini, öz mənafeyi və nəfsi xatirinə bir çox ocaqları söndürdüyünü dəfələrlə yazıb göstərmiş, murdar əxlaqını tənqid etmişdi. 1849-cu ilin oktyabr ayında Şuşa vilayətinin rəisi Tarxan Mauravov böyük bir dəstə ilə Zakirin yaşadığı Qarabağın hakimi Mehdiqulu xanın ona bağışladığı Xındırıstan kəndinə basqın edib qoca şairi ailəsi ilə birlikdə həbs edir. Bu dəstədə Zakirə düşmən münasibət bəsləyən, bir çox Qarabağ bəyləri ilə yanaşı Səfərqulu xan Nəva da var idi 5, 5 .

Şairin ifşa etdiyi tipləri "dövlətü malı əndazədən çıxanlar", mahalı "çapıb talayanlar" olan yerli çar məmurları idi ki, bunlardan biri də Xandəmirov idi:

"Görsən tanımazsan yarımsaqqalı,
Çıxıb əndazədən dövlətü malı,
Xandəmirov çaldı-çapdı mahalı
O ki, tutub özün keçəl qurumsaq" (3, 22).

Şair göstərir ki, bu və bunun kimi yaramazlar taun kimi ölkənin hər yerinə yayılmış, xalqın "gününü qara əskiyə bükmüş, sonsuz zorakılıqla məşğuldurlar. Şair satiralarında göstərir ki, idarə və məhkəmələrə soxulmuş şöhrətpərəst adamlar qanunları qorumaq, onlara əməl etmək əvəzinə ölkədə cinayətin, özbaşınalığın həddini aşması üçün özləri şərait yaradırlar. Zakir çar hakimlərinin və yerli ağaların özbaşınalığını, rüşvətə qurşandıqlarını qəzəblə lənətləyirdi:

"Yüz təşnələbi-qəhr olasan, xadimi-dövlət
Verməz bir içim su sana ta almaya dərya.
...Divan demə, hərgiz buna kim, afəti-candır,
Mən söyləmədim, nola ki, məşhuri-cahandır" (3, 86).

Şair əsasən öz tənqidini konkret həyat hadisələrinə əsaslanan sosial-siyasi məsələlər üzərində qurmuş, real həyatda gördüklərinə əsaslanmışdı. Belə ki, Zakirin yaşadığı dövrdə çar hökuməti Azərbaycanda öz müstəmləkəçilik siyasətini həyata keçirərkən gah bəy və mülkədarların hüquqlarını məhdudlaşdıran fərmanlar vermiş, gah bəylərin imtiyazlarını yenidən özlərinə qaytarılması haqqında qərar çıxararaq öz tərəfdarlarının sayını artırmaq məqsədilə "süni bəylər" yaratmağa başlamış, gah bəy və mülkədarların kəndlilər üzərindəki əvvəlki ağalığını təsdiq edən qanunlar çıxararaq xalqın sürətlə təbəqələşməsinə şərait yaratmışdı. Yaranmış bu ziddiyyətli tarixi şərait Zakirin milli şüurun formalaşmasında katalizator rolu oynayan realist satiralarında öz parlaq əksini tapmışdı.

Şair bir-birinin ardınca verilən çar fərmanlarını nəzərdə tutaraq onları lağa qoyur, ifşa edirdi. Təzadlar üzərində qurulan bu şeirdə Zakir bir tərəfdə "tağar-tağar əkilən" arpa, buğda zəmiləri "pərqü balışlı" yatacaqları, bahalı xalılı evləri, bər-bəzəkli xanımı, min tümənlərlə altunu olan bəylər, o biri tərəfdə isə bezə, qədəyə qənaət edən, ac-yalavac əyalından xəcalət çəkən, həsir döşəli evində altına öküz palanı salan, "pula güllə atan" barkeşlər – kəndlilər dururlar. Şair şeirdə həmçinin Çar Rusiyası tərəfindən hüquqları əllərindən alınıb keçən əyyamdakıları yad edib ağlayan, pis yaşamaqdansa, qürbət ölkələrə köçüb getməyi üstün tutan bəylər, mülkədarlar "rəiyyətlə boyunduruq yoldaşı" olduqlarına görə "Çakəri-dilxunu görən canımız" – deyə fəryad qopardıqlarını əks etdirmişdi:

"...Bu zülmü insana eyləməz insan,
Saf cana yetişdik aman, əlaman!
Bir neçə laməzhəb, adı müsəlman,
Mürtədü məluni görən canımız" (3, 43).

Zakirin satiralarında XIX əsrin birinci yarısındakı mülkədar kəndli münasibətlərinin bir çox mühüm, tipik cəhətləri də öz əksini tapmışdı. Şair bəy və mülkədarların xalqa zülm etməkdə çar məmurları ilə əlbir olduqlarını, onlardan geri qalmadıqlarını, yoxsul, əməkçi kəndlilərlə "insaf və mürvətdən" kənar rəftar etdiklərini kəskin satira atəşinə tutur, yırtıcı təbiətə malik olan, "rəiyyəti şişə taxan" bəylərə, mülkədarlara, xanzadələrə nifrət oyatmaqla, onları hərtərəfli tanıtmaqla mənsub olduğu xalqın milli şüurunun formalaşmasına sosial-siyasi ideyaları ilə xidmət edirdi.

Zakirin başına gələn müsibətlər – Şuşa vilayətinin rəisi Tarxan Mauravovun böyük bir dəstə ilə Xındırıstan kəndinə basqın edib, qoca şairi ailəsi ilə birlikdə həbs edib onu Bakıya sürgün etdirməsi, oğlu və qardaşı oğlu Rüstəm bəyin həbs edilib sürgünə göndərilməsi, qaçaqçılıq edən digər qardaşı oğlu Behbud bəyin tutulub vəhşicəsinə öldürülməsi, ailəsinin dağılması belə şairin yenilməz vüqarını sarsıda bilməmişdi. Şair ona qarşı yönələn bütün haqsızlıqlara etiraz edərkən sosial-siyasi mühitlə və zamanla qarşı-qarşıya gəlmişdi. Onun dövründə zülmün daşıyıcıları əllərində və arxalarında hakimiyyət olan təbəqələr olduğundan Zakirin tənqid hədəfi də məhz onlar olmuşdur. O, qanunsuzluqlara, haqsızlıqlara, hərc-mərcliyə, mənəviyyatsızlıqlara qarşı çıxmışdı.

Şair satira və həcvlərində müasirləri olan Səfərqulu xan Nəva, Əmiraslan bəy, Mehdi bəy Kəbirli, Hüseyn bəy, knyaz Xasay kimi konkret, real böyük mülkədar və bəyləri feodal dünyasının yırtıcı, eybəcər nümayəndələri kimi təsvir, təqdim və tənqid edərək onların iç üzünü açıb xalqa çatdırmışdı. Zakir onların pozğun rəftarını, yırtıcı təbiətini ifşa etmək üçün xalqın bədii təfəkküründə kök salmış surətlərdən, xalqa məxsus ifadələrdən, təşbihlərdən gen-bol istifadə etmişdi.

Zakirin tənqid hədəflərindən biri də xalqın sosial-siyasi həyatına nüfuz edən dövrünün ikiüzlü, dələduz, satqın din xadimləri olan qazilər idi. Şair açıq-aydın görürdü ki, şəriət məhkəmələri din pərdəsi altında ölkədə hər cür oğurluğun, quldurluğun artması üçün şərait yaradırlar. Ona görə də, şair çəkinmədən satirik şeirlərində şəriət məhkəmələrinin iç üzünü açıb göstərmiş, bədii təzad vasitələrindən istifadə edərək qazilərin sözü ilə əməli arasındakı ziddiyyətləri aşkar etmiş, sərrast ifadələrlə onlara qarşı öz kəskin tənqidi münasibətini bildirərək məqsədini xalqa çatdırmağa nail olmuşdu:

"...Atlanıb biri çapar Təkləyə day, danə üçün,
Biri də şamü səhər talibi-dirhəm qazi (3, 49-50).

Mövhumat və fanatizmə, dini təriqətlərə, şəriət məhkəmələrinə, mürtəce adətlərə qarşı mübarizədə xalqın sosial-siyasi mənafelərini müdafiə edən humanist şair Zakirin satiralarının hədəf dairəsi çox genişdir. Onun satirik şeirlərində, mənzum hekayə və təmsillərində feodal cəmiyyətinin xəbis darğalar, tacirlər, fırıldaqçı hakim və nüsxəbəndlər kimi digər tüfeyli zümrələri də kəskin satira atəşinə tutulmuşdur.

Ümumiyyətlə, Qasım bəy Zakirin feodal qayda və adətlərinə, mürtəce dini ehkamlara, geriliyə, milli zülm və sosial-siyasi ədalətsizliyə, əhalinin hüquqsuzluğuna və savadsızlığına qarşı çıxışları xalqın milli şüurunun formalaşması, onun azadlıq və xoşbəxt gələcək haqqındakı arzuları ilə səsləşir.

**Ədəbiyyat**

1. Bakıxanov A.A. Bədii əsərləri. Bakı, Azərnəşr, 1964, 290 s.
2. Bakıxanov A.A. Seçilmiş əsərləri. Bakı, Yazıçı, 1984, 476 s.
3. Qasım bəy Zakir. Seçilmiş əsərləri, Bakı, 2005, səh. 23, 22.
4. Məmmədov K., Q.Zakir, Bakı, "Elm", 1957.
5. Məmmədov Kamran, ön söz Qasım bəy Zakir. Seçilmiş əsərləri, Bakı, 2005.
6. Saraçlı Mətanət (Həsənova), Qasım bəy Zakir realizminin xalqın milli düşüncəsinin formalaşmasında yeri Bakı Universitetinin Xəbərləri, № 4, Humanitar elmlər seriyası, Bakı, 2012.
7. Ömərov Vahid, Abbasqulu Ağa Bakıxanov siyasi irsi və insan haqları "Səs qəzeti, 24 may 2016.

**The influence of socio-political views of Abbasgulu Aga Bakikhanov and Gasim bey Zakir on the development of national identity in Azerbaijan in the XIX century**

**Summary**

The article discusses the facts of the relationship of our leading intellectuals who were not afraid to touch on the occupation of independence of the Azerbaijani at the beginning of the 19th century, the process of developing national identity, intransigence to the injustices of their time and deep faith in the final victory of truth and justice.

In particular, is analysed a deep understanding of A.A.Bakikhanov's difficulties and hardships of society, people's psychological attitudes, their outlook on life, their attitude to it, a consistent approach to social problems, which saw the elimination of social vices in enlightenment people, the welfare of society in good deeds and mutual good intentions.

At the same time, Gasim bey Zakir's critical attitude to the socio-political events of that time, the exposure of the morals and behavior of those in power, who described the ugliness of his time in his satires, was seen in the feudal rules and customs of reactionary religious doctrines, in backwardness and national oppression.

**Влияние общественно-политических взглядов Аббасгулу Ага Бакиханова и Гасым бека Закира на развитие национального самосознания в Азербайджане в XIX веке**

**Резюме**

В статье рассматривается факты отношения наших ведущих просветителей, которые не боялись коснуться вопросов оккупации независимости Азербайджана в начале 19 века, процесса развития национального самосознания, непримиримости к несправедливостьям своего времени и глубокой веры в окончательную победу правды и справедливости.

В частности анализируется глубокое понимание А.А.Бакихановым трудностей и невзгод общества, психологических установок людей, их взглядов на жизнь, отношения к нему, последовательного подхода к социальным проблемам, который видел устранения социальных пороков в просвещении людей, благополучия общества в добрых делах и взаимных благих намерениях.

В то же время изучается критическое отношение Гасым бека Закира к общественно-политическим событиям того времени, разоблачение нравов и поведения властеимущих, который в своих сатирах описывал безобразие своего времени, видел причины этих несправедливостей в феодальных правилах и обычаях реакционных религиозных доктрин, в отсталости и национальном угнетении.

Göndərilib: 19.04.2020 Qəbul edilib: 21.04.2020

DOI: 10.36719/AEM/2007-2020/53/156-157

**Şəlalə Sabir qızı Salmanova**
Bakı Dövlət Universiteti

# QURANDA ELM VƏ ÖYRƏNMƏYƏ TƏŞVİQ
**(Tezislər)**

***Açar sözlər:*** *İslam, Quran, elm, təfəkkür, ağıl*
***Key words:*** *Islam, Koran, science, thinking, mind*
***Ключевые слова:*** *Ислам, Коран, наука, мышление, ум*

Allah Təalanın bəşəriyyətə nazil etdiyi ən son nazil etdiyi ən son, ən mükəmməl din olan İslam dininin gücü, üstünlüyü onun müqəddəs kitabı Qurani-Kərimin əsrlərdən - əsrlərə dəyişilməmiş və təhrif olunmamış şəkildə bizə gəlib çatmasıdır. Qed etmək istərdik ki, heç bir din İslam dini qədər sağlam düşüncəyə, elmə, ağıl və iradəyə, hürriyyətə önəm verməmişdir. Peyğəmbərlərin sonuncusu Həzrəti Məhəmməd Peyğəmbər Allah kəlamını bizə çatdırarkən və şəriət qaydalarını qurarkən bizi kor-koranə təqlidə sövq etməmiş, həqiqəti görməyə, anlamağa, öyrənməyə, ağlımızdan istifadə etməyə çağırmışdır. İslamda ağıl dinin əsasıdır, ağlı olmayan kəs isə şəriət qayda-qanunlarından sorumlu deyil. Ağlı olan, lakin zamanında, vaxtında döşünməyən insan isə peşmançılıq hissindən əziyyət çəkər. Əl-Mülk surəsi, 10: "Onlar: Əgər biz (peyğəmbərlərin öyüd- nəsihətinə) qulaq asıb ağlımızı başımıza yığsaydıq, cəhənnəm əhli içində olmazdıq! – deyəcək".

Ağıl sahibləri isə Quranda təriflənir, hər kəsdən üstün tutulur. Bu cür insanlara, əl-Araf surəsi, 199-cu ayətində: "Sən bağışlama yolunu tut, yaxşı işlər görməyi əmr et və cahillərdən üz döndər"- deyə müraciət edilir.Həmçinin. müqəddəs Kitabımıza görə, insan bilmədiyi şey üzərində israr etməməlidir: Əl-isra, 36: "Ey insan! Bilmədiyin bir şeyin ardınca getmə (bacarmadığın bir işi görmə, bilmədiyin sözü də demə), çünki qulaq, göz və ürək – bunların hamısı [sahibinin etdiyi əməl, dediyi sözü barəsində sorğu-sual olunacaqdır]". Əbu Səid-i hudrinin nəql etdiyi bir hədisə görə, Hz.Məhəmməd (), İmanlının əlaməti ağıldır. Onun ağlı nə qədərsə, ibadəti də o qədərdir" və ya: Bir zərrəlik ağıl, orucdan da, namazdan da yaxşıdır" demişdir.

Ümumiyyətlə, Quranda 217 ayət bilik və irfandan, 185 ayət kitabdan, 179 ayət haqq və batıldan (haqsızlıqdan), 63 ayət iradədən bəhs edir. Əl-Furkana görə, Allahdan başqasının biliyi məhduddur, lakin insan Allahdan elm, bilik istəyə bilər. Hətta İslam Peyğəmbəri Məhəmməd Əleyhissəlama vəhy olunmadan əvvəl Quranı oxumaqla tələsməmək və (Ta-ha, 114): "Pərvərdigara! Mənim elmimi artır!" – de" deyərək müraciət etmək tövsiyə edilir. Yəni, Allah insana oxuduğunu, qəbul etdiyini anlayaraq, dərk edərək qəbul edilməsi müqəddəs Kitabımızda pislənir, insanı şüursuz təqliddən əl çəkməyi əmr edir, onu idraka, təfəkkürə əsaslanaraq, doğru yolu seçməyə çağırır, (Bəqərə surəsi, 170): "Bütpərəstlərə: "Allahın göndərdiyinə Qurana tabe olun! – deyildiyi zaman, onlar "Biz ancaq atalarımız getdiyi yolla gedəcəyik" – deyirlər. Bəs ataları bir şey anlamayıb, doğru yolda deyildilərsə necə?(Yenədəmi onlara tabe olacaqlar?)".

Quranda elmə, elm adamlarına yüksək qiymət verilir, "Tanrıdan ancaq qullarının bilikli, elmli olanları qorxar...." (Əl-Fatir, 28). Bu ayəti-kərimə elmlə din arasındakı müqəddəs bağlılığı güstərir. Əlbəttə, insanların həqiqəti qavramaq, qəbul etmək qabiliyyəti və istəyi eyni deyildir, bu səbəbdən də Hz.Məhəmmədə, "Göndərildiyin xalqdan hər tayfanı öz hal və şanına uyğun irşad et...." (Əl-Nahl, 125).

Həmçinin, Quranda elmə təşviq edən bir çox ayətlər mövcuddur. əl-Mücadələ, 11: "Ey iman gətirənlər! Sizə:"Məclislərdə [mömin qardaşlarınıza] yer verin! – deyildiyi zaman (onlara) yer verin ki Allah da sizə [cənnətdə] geniş yer versin. Eləcə də sizə:"Qalxın! deyildikdə, qalxın ki, Allah da sizə iman gətirənlərin və (xüsusilə) elm bəxş edilmiş kimsələrin dərəcələrini ucaltsın. Allah etdiyiniz əməllərdən xəbərdardır!", Əl-Alaq surəsi, 1-5: 1. "Ya Peyğəmbər! Qurani Kərimi bütün məxluqatı yoxdan yaradan Rəbbinin adı ilə (Bismillah deyərək) oxu! 2. O, insanı laxtalanmış qandan yaratdı, 3.(Ya Peyğəmbər!) (Oxu! Sənin Rəbbin ən böyük Kərəm sahibidir! 4. O Rəbbin ki, qələmlə yazmağı öyrətdi 5. O Rəbbin ki, insana bilmədiklərini öyrətdi".

Bu ayət isə bir daha ağıl sahiblərinin üstünlüklərini bizə göstərir: "Əz-Zümər, 9: "Yoxsa o (inkar edən kimsə), gecə səcdə edərək və qiyamda duraraq ibadət edən, axirətdən çəkinən və Rəbbinin rəhmətini diləyən kimsə kimidirmi? (Ey Məhəmməd!) De ki: heç bilənlərlə bilməyənlər bir olurmu? Doğrusu ancaq ağıl sahibləri bunları haqqı ilə düşünür".

Əlbəttə. Bunlarla yanaşı, insanların bilə bilmədiyi şey də var ki, bu gizli bir bilikdir – elmi –lədündür. (Hz.Xızırla, Hz.Musa qissəsində olduğu kimi, biri digərinin hərəkətlərini istəsə belə anlaya bilməz, çünki bu elm hətta hər peyğəmbərə belə Allah tərəfindən verilməz). Bununla yanaşı, bizdən hər birimiz ruh haqqında

daha çox bilmək istərdik.Qurani Kərim: "Ey Məhəmməd! Sənə ruh haqqında soruşarlar. De ki: bizə ruh haqqında az bir şey öyrədilmişdir".

Məlumdur ki,bir çox İslam elmləri, fiqh, kəlam və s.elmlər müqəddəs Qurani-Kərimə əsaslanır. İnsanın yaradılış mövzusu Quranda hələ 1400 il bundan əvvəl müasir tibb elminin yalnız XX-XXI əsrlərdə uzun tədqiqatlar sayəsində əldə etdiyi nəticələrlə üst-üstə düşür. Quranda embrion haqqında laxtalanmış qan mərhələsində zəliyə və ya çeynənilmiş gilə bənzədilir və bildirilir ki, o yalnız 40-42 gün insana bənzəməyə başlayır. Dünya şöhrətli tanınmış professor, elmi məsləhəətçi, Anatomlar Assosiyasiyasının üzvü s. bu nəticəni qoymuş təcrübələr və elmi tədqiqatlar nəticəsində əldə etmiş və VII əsrdə Həzrəti Məhəmməd Peyğəmbərin (S.A.S) bu bilgilərə. İnformasiyaya yalnız ilahi mənbədən yiyələndiyini qəbul etmişdir.

Məlumdərdur ki, əgər dəri örtüyündə yanıq varsa, ağrı hiss olunur. Quranda cəhənnəndə odla verilən əzab təsvir edilərkən, deyilir ki, dəri yandiqda Allah Təala dəri qatını bərpa edir ki, kafirlər yenidən o əzabı dadsınlar. Ər-Riyadda VIII Tibb simpoziumunda iştirak etmiş Taylan Universitetinin tibb fakültəsinin məşhur professoru, dekanı Tajata Tajoso bütün bunları tibbi cəhətdən təsdiqləmişdir, öz çıxışının sonunda kəlimeyi-şəhadəti söyləmiş, İslamı qəbul etmişdir. Onun mühazirələrində iştirak etmiş beş dinləyici həmçinin İslam dinini qəbul etmişlər.Həmçinin Qurani-Kərimdə bütün kainatın isti tüstüdən yaradılması haqda bizə xəbər verilir. Məşhur astronom-alim Yaponiyalı Eşiti Ozan müasir astronomiyanın yalnız son illərdə bu nəticəyə gəldiyini söyləmişdir. Belə misallar çox çəkilə bilər. Bu cür dəqiq, heyrətamiz məlumətların Quranda keçməsi Allah Təalanın güc və qüdrəti, Hz.Məhəmməd (S.A.S.)-ın həqiqi Peyğəmbər olaraq ən böyük möcüzəsinin Quran olduğunu, İslamın ağıla, idraka, təfəkkürə nə qədər önəm verdiyini, 1400 il bundan əvvəl bilikləri bizə verməklə bizi elmi cəhətdən istiqamətləndirdiyini, bizi elm və mərifət sahibi kimi görmək istədiyini bir daha isbatlayır. Bununla da, Allah Təala bizə kainatın sirlərini tədricən açmışdır. İslam dininin müqəddəs kitabı hər bir alimə öz elmi ilə başqaları ilə bölüşməyi paylaşmağı, bildiyini öyrətməyi əmr edir, bildiklərini əsirgəyənləri qınayir. əl-Bəqərə, 159: "Kitabda (Tövratda) insanlara aşkar etdimiz dəlillərdən sonra göndərdiyimiz nişanələrivə doğru yol göstərən ayələrimizi gizlədən şəxslər Allahın lənətinə düçar olar və bütün lənət bilənlər də onlara lənət oxuyar!"(bu mövzuda həmçinin Əl-Bəqərə, 129, 151, 174; ət-Tövbə, 122, əl-Abəsə, 1-4).

**Ədəbiyyat**

1. Qurani-Kərim, tərcümə edənlər: Z.Bünyadov və V.Məmmədəliyev, Azərnəşr, 1992
2. Kurani-Kerim ve açıklamalı mealı, Səudiyyə Ərəbistan krallığı, Medinei-Münevvere, 1987

**Rəyçi: dos. B.Quluzadə**

Göndərilib: 19.04.2020 Qəbul edilib: 21.04.2020

ELMİ İŞ (beynəlxalq elmi jurnal) 2020, №04/53 ISSN 2663 – 4619 / Print
fəlsəfə və sosiologiya / philosophy and sociology / философия и социология

DOI: 10.36719/AEM/2007-2020/53/158-160

**Aydan Habil qızı Məhərrəmova**
Azərbaycan Turizm və Menencment Universiteti
aydan.meherremova.1993@mail.ru

# DÜNYA ÖLKƏLƏRİ ÜZRƏ İNTİHARLARIN BAŞ VERMƏ SƏBƏBLƏRİ

***Açar sözlər***: *intihar, intihara səbəblər, intiharın statistikası, dünyada intihar*
***Key words:*** *suicide, causes of suicide, suicide statistics, worldwide suicide*
***Ключевые слова:*** *самоубийство, причины самоубийства, статистика самоубийств, всемирное самоубийство*

## Giriş

İntihar dünyanın əsas problemləri sırasında sadalanmaqda və qarşısı heç bir ölkədə tam alına bilməməkdədir. Ölkələrin fərqli sosial durumu, rifah şəraiti, adət- ənənələri, coğrafi mühiti onlarda intihar səbəblərinin fərqliliyinə səbəb olur. İntiharın ümumi səbəblərini bilmək və araşdırmaq üçün dünya ölkələri nümunələrinə nəzər salınmalıdır, eyni zamanda bu səbəbləri aradan qaldırmağın hansı yollarının mövcudluğu aydınlaşdırılmalıdır.

İntihar ( latın sözü olub “sui” – özünü, “seadere” – öldürmək deməkdir.) müstəqil və könüllü şəkildə bir insanın öz həyatına qəsd etməsidir (1, səh 4-5).

İntihara gətirib çıxaran əsas səbəblər arasında bunlar sadalanır: kəskin problemlər ( məsələn, fərd üçün ona vacib olan insanlarla yaşadığı problemlər, qarşıdurmalar, ailədə birinin ölümünün yaratdığı depressiya, bunlardan başqa əhəmiyyətli itkilər, imtina edilmək, iş itkisi, həbs, ağır xəstəlik diaqnozu, pul problemləri və s), xroniki problemlər ( məsələn, evlilikdən kənar münasibətlərin tərəflərin biri tərəfindən öyrənilməsi, ailədə uşaqlarla bağlı problemlər), sağlamlıqla bağlı problemlər (məsələn, boyun və üz əməliyyatlarının uğursuzluqla nəticələnməsi, amputasiya edilmənin verdiyi umidsizlik, epilepsiya xəstəliyi), psixiatrik pozğunluqlar (məsələn, depressiya, alkoqol düşkünlüyü, ruh düşkünlüyü, tənhalıq duyğusu və s.).

Bu səbəbləri ümumiləşdirsək bu cür sıralamış olarıq: depressiya, iş və ailede olan gərginliklər, xəstəliklər, psixi pozntular və s (2, səh 6-8).

İntihar nisbəti dünya ölkələri üzrə fərqli görülməkdədir. Bütün dünyaya aid olan intihar problemi 2016-cı ilin göstəricilərinə görə ən yüksək həddini Qayanada göstrərir. Bu göstəricilərə görə ilk beşlikdə Qayana, Lesoto, Rusiya, Litva, Suriya dayanır (3).

Ən yüksək intihar göstəricisinin görüldüyü Qayana Cənubi Amerika ölkəsidir. Qayana Cənubi Amerikanın şimal-şərq sahillərində yerləşir. Ölkədə intiharın əsas səbəblərini ifadə etsək bunlar sadalanar: yoxsulluq, psixi və stiqma problemləri, alkoqolizm, zorakılıq, həmçinin psixoloji yardım mərkəzlərinin olmaması. Stiqma əsasən ölkədə olan cadugarlara yönəlmişdir, onlara olan inamsızlıq, həmçinin din xadimlərinin onlara qarşı yüksək təzyiqi onları intihara yönəltməkdədir (4, № 12)

Heç bir psixoloji yardım mərkəzinin fəaliyyət göstərməməsi insanların yardım ala bilməməyinə, depressiyaya tab gətirməməyə və intihara gətirib çıxarır.

Ümumi Amerika qitəsinin ölkəri üçün intihar səbəblərini araşdırarkən ortaya çıxan sadalama: 1) genetik faktorlar (şizofreniya, bipolyar pozğunluğu, travmatik sindrom), 2) depressiv səbəblər (stress, sevdiyini itirmə qorxusu, 3) ümumi səbəblər ( işsizlik, boşanma, ailə problemləri).

ABŞ-ın intihar göstəricilərində əsas yeri hərbiçilərin intiharı tutur. Əsgərlərin ölümünün ikinci səbəbi intihardır. Əsgərlərin intihar səbəbləri arasında depressiya, alkoqolizm, hərbi əməliyyatların çoxluğu və bunun təsiri altında yaranan stress, həmçinin kəskin iqlim şəraitində xidmət çəkənlərdə yaranan xəstəliklər və bu xəstəliklər qarşısında dözümsüzlük dayanır. Bəzi ərazilərdə xidmət çəkənlərin intihar səbəbi maddi problemlərlə, bəzi ərazilərdə isə həddən artıq içki asılılığı ilə bağlıdır. Məlumatlara görə ABŞ-da bir ildə 540-dan çox hərbiçi intihar etmişdir. Yetkinlik yaşına çatmayanların intiharı baxımından ABŞ dünyada ən yüksək dərəcəni göstərən ölkələrdəndir. Bu intihar səbəblərini araşdıran mütəxəssislərin rəylərinin əsas nəticəsi eroinin dozasının həddən artıq istifadəsidir. Digər səbəblər arasında qarşılıqsız sevgi, ailədaxili problemlər, təhqirlərə, alçaldılmağa məruz qalma və s. daxildir. Amerikalılar xəstəlik qarşısında zəif, xəstəliyə və bu xəstəliklə yaşamağa dözməyən, xəstəliklə bir ömür yaşamaqdansa intiharı üstün tutan insanlardır. Əgər 20-ci əsrdə Amerikada yetkinlik yaşına çatmayanlar diqqət çəkmək üçün, fəryadlarını hayqıraraq kömək diləmək üçün intihar etməyi seçirdilərsə, 21-ci əsrdə sadəcə həyatlarından tamamilə imtina etdikləri, kömək gözləmədən sadəcə xilas olmağı istədikləri üçün intiharı seçirlər. Ölkədə intiharın çox olmasının digər səbəbi xilas etmə xətlərinin yardım istiyənlərə inanmamalarıdır (5, səh 2-5).

Qeyd edək ki, Amerikalılar arasında inthar hadisələrinin sayı son 12 ildə 70 % artmışdır. Amerikada intihar göstəricilərinin əsası təhsilsiz əhalidə görülməkdədir. Amerikada intihar məsələsi yalnız məşhurların intiharı zamanı gündəmə yatırılır. Bu məşhurlar arasında Anthony Bourdain və Kate Spade yer alır.

İntihar nisbətinin ən yüksək ikinci göstəricisi Afrika ölkəsi olan Lasotadadır. Lasota timsalında bütün Afrikadakı intihar səbəbləri araşdırılacaq olsa, görülər ki, Afrikada olan intihar səbəbləri tam olaraq tədqiq olunmamışdır, lakin burda görülən əsas səbəb yoxsulluq və heç bir psixoloji dəstək mərkəzinin olmamasıdır (6).

Rusiya intihar göstəricisinə görə üçüncü yeri tutmaqdadır. Bu ölkədə kişilərin intiharı qadınların intiharından 6 dəfə yüksək, kənd yerlərində baş verən intiharların sayı şəhərlərdə baş verən intiharlardan 2 qat çoxdur. İntihar edənlərin əksəriyyəti 15-59 yaş arası və əmək qabiliyyətli şəxslərdir. Ölkədə intiharın əsas səbəbi alkoqolizmdir.

Amerikada olduğu kimi Rusiyada da yeniyetmələrin intiharı çoxluq təşkil etməkdədir. Ölkədə yeniyetmələrin intiharının əsas səbəbi bir şeydən əziyyət çəkdikləri halda hislərini açıq şəkildə ifadə etmələrinə icazə verilməməsi və nəticədə zehni pozğunluğa və psixoloji travmalara məruz qalmalarıdır. Uşaq intiharı Rusiyada getdikcə artmaqdadır. Buna səbəb valideynlərin və müəllimlərin onlardan yüksək gözləntiləri və bu gözləntilərin qarşılığını verə bilməyən uşaqların intihara meyllənmələridir. Xüsusi ilə damğalanmağa məruz qalan uşaqlar tək çıxış yolunu bunda görürlər. Araşdırmaların nəticəsi göstərmişdir ki, uşaq intiharlarının 20% -i may ayında, yəni Dövlət Yekun Attestasiyasının keçmə vaxtı baş verir. Depressiv hal yaşayan uşaqlar öz fikirlərini ailələri ilə bölüşə bilməyən uşaqlardır və ailə uşaqların bu halına biganə, inamsız yanaşır və bu uşaqlarda intihar istəyi ilə nəticələnir.

Psixoloji travmalara məruz qalanlar əsasən hüquq-mühafizə orqanlarının əməkdaşlarıdır. Onlar davamlı olaraq ağır stress altında çalışırlar və bu ağır psixososial ağırlıqdan qurtulmaq üçün intihardan başqa çıxış yolunun olmadığına qərar verir və bu yola əl atırlar. (7, səh 20-23)

Baltikyanı ölkələrdə intihar səbəbləri araşdırılarkən ən yüksək intihar nisbətinin aid olduğu Litva daha dərindən araşdırılmışdır. Litva Avropada intihar göstəricilərinə görə birinci yerdədir. Ölkənin yüksək intihar göstəricisinə malik olmasının əsasən iki səbəbi mövcuddur: işsizlik və alkoqolizm. Litvada mövcud olan iş azlığı, şəxsi biznesin inkişaf etdirilə bilməməsi, pensiya yaşından əvvəl işin itirilməsi yüksək depressiyaya, stresə gətirib çıxardır. Bu cür yaşayışı qəbul etməyən əksər Litvalılar Skandinaviya ölkələrinə üz tutaraq orda iş qurub həyatlarını nizama salmağa çalışırlar, lakin digər ölkəyə üz tuta bilməyənlər yaşanan stresə dözməyərək intihara meyllənirlər. Litva alkoqol istehlakına görə dünya lideridir. Burada intiharların 80 %-i sərxoşluq zamanı baş verir.

Beləliklə, Litvanın bütün intihar səbəbləri sadalanarkən: psixi səbəblər, həddindən artıq spirtli içki qəbulu, depressiya, şəxsi həyat faciəsi, gözlənilmədən baş verən bədbəxt hadisə və bunun həyatın sonu hissinin yaratması qeyd olunur. Hətta Litvanın facebook səhvəsində yaranan “İntihar Klubu” səhvəsində intihar etməyin qaydaları, üsulları ətraflı verilmişdir. (8, səh 166)

Bir vaxtlar intiharın ən yüksək göstəricilərinə malik olan Skandinaviya ölkələri artıq intiharın sayına görə liderlik etmirlər (9, səh 6-10). Skandinaviya ölkələrində intiharın əsas səbəbi dərin depressiyadır. Mövcud iqlim şəraitinin ölkə əhalisinə verdiyi gündüz qısalığı və gecə uzunluğu əhalidə dərin depressiya yaradır və onları intihara sürükləyir. Eyni zamanda bu ölkələrdə “Yante” qanunu mövcuddur, hansı ki, gündəlik həyatda bütün skandinaviyalıların hamı kimi olması fikri irəli sürülmüşdür. Bu qanuna tabe olmamaq sözlə qınanmasa da, qanuna tabe olmayanlar öz beyinlərində özlərini qınağa çəkir və özlərində bunun stress və depresiyasını yaşayır, bu da onlarda intihar istəyi yaranmasına gətirib çıxarır.

Yaponiya intihar göstəriciləri yüksək olan ölkələrdəndir. İntihar nisbəti bir çox ölkədən az görülsə də, ölkə üçün yüksək göstəricidir. Yaponiyada təxminən hər gün 60 nəfər intihar edir. İntiharın əsas qurbanları işini itirməmək üçün çox işləyən, hətta fasiləsiz, tətilsiz, işdən sonra evdə işi davam etdirənlərdir. Yaponiyada intihar səbəbləri yaş qrupuna görə fərqlidir. Yaponiyanın gənc əhalisi arasında ən çox intihar edənlər tələbələrdir. Tələbələr arasında isə qızların intiharı oğlanların intiharını üstələyir. Tələbələrin intihar etmələrinin əsas səbəbləri ünsiyyətdə çətinliklər, məktəblərdə, xüsusi ilə müəllim dərsə cavab verməyi tələb edərkən tələbənin göstərdiyi müvəffəqiyyətsizlik, ailədə valideynlərlə münasibətlərin gərginləşməsi, həmçinin zorakılıq hallarının yaşanmasıdır. Oğlan uşaqlarının intihar etmələrinin əsas səbəbləri isə valideynləri tərəfindən cəzalandırılmaq və onlara töhmət verilməsidir.

Gənc nəslin intiharının digər səbəbi cavabsız sevgidir. Sevgisinin qarşılığını ala bilməyən gənc uzun depressiyadan sonra intihara qərar verir. Gənclər arasında intiharın bir digər səbəbi ailə üzvlərinin itirilməsinə dözümsüzlükdür. Gənc yaşda valideynin itkisini qəbul etmənin çətinliyi intiharla nəticələnir.

Fukusima-1 atom elektrik stansiyasının qəzası baş verdikdə və hətta baş verdikdən illər sonra bu qəzanın verdiyi fəsadlar, psixi pozğunluq, mənfi təsirlər bir çox insanı intihara sürükləmişdir.

Yaponiyada intihar səbəbləri yaş qrupuna görə fərqlidir. Yaponiyanın gənc əhalisi arasında ən çox intihar edənlər tələbələrdir. Tələbələr arasında isə qızların intiharı oğlanların intiharını üstələyir. Tələbələrin intihar etmələrinin əsas səbəbləri ünsiyyətdə çətinliklər, məktəblərdə, xüsusi ilə müəllim dərsə cavab verməyi tələb edərkən tələbənin göstərdiyi müvəffəqiyyətsizlik, ailədə valideynlərlə münasibətlərin gərginləşməsi,

həmçinin zorakılıq hallarının yaşanmasıdır. Oğlan uşaqlarının intihar etmələrinin əsas səbəbləri isə valideynləri tərəfindən cəzalandırılmaq və onlara töhmət verilməsidir.

Yaponiyada ən çox yayılan intihar növü "Oyaho shinju", yəni "ikiqat" intihardır. Əsasən ruhi xəstəliyi olan qadınların həyata keçirdiyi intihardır. Özlərinin həyatına son verməklə yanaşı övladlarının da həyatına son qoyurlar ( 10, səh 35–38).

**Nəticə**

Mövzuda ilk olaraq intiharın ümumi izahına yer verilmişdir. Daha sonra ümumi yaranma səbəblərinə toxunulmuşdur. İntiharın dünya üzrə hansı səbəblərdən və statistik olaraq hansı tezlikdə baş verməsi qeydə alınmışdır. Məqalədə həmçinin profilaktik tədbirlərin hansının bu xüsusda daha önəmli olması nəzərə çatdırılmışdır. Ayrı -ayrı dünya ölkələrində intiharla bağlı səbəblər və çıxış yolları nümunələrinə nəzər salınmışdır. İntihar nisbətinin yüksək görüldüyü ölkələrdəki səbəblərin fərqliliyi və hansı tədbirlərin çatışmazlığı göz önünə gətirilmişdir. Ölkələr üzrə intihar səbəblərinin oxşar və fərqli səbəblərini ayırd etməyə imkan yaradılmışdır. Göstərilən nümunələr bütün dünya ölkələrini əhatə etməsə də, intihara dair yüksək göstəricilər göstərən ölkələri izah etmişdir.

**Ədəbiyyat**


1. Halil Apaydın-Şuayip Özdemir-Ayşe Z.Ünal, 2012:4-5
2. Prof. Dr. Nevzat YÜKSEL. İntiharın Nörobiyolojisi. İSTANBUL 2001, 6-8 s.
3. https://fjord.su/article/kolichestvo-samoubiystv-v-skandinavii.html
4. Алинин С. Ф., Антонов Б. Г., Ицков А. Н. Правда о бойне в джунглях Гайаны // Собеседник. — 1987— № 12
5. Am J Epidemiol. Firearms and Suicide in the United States: Is Risk Independent of Underlying Suicidal Behavior? 2013; 2-5
6. https://mbk-news.appspot.com/suzhet/strany-lidery-po-chislu/
7. Новгородская область: Специальный доклад «Особенности региональных аспектов суицидального поведения и проблемы его профилактики» 2012: 20-23
8. V1irnik A. Suicide in Estonia. Acta Psychiatr Scand 1991: 166
9. Paerregaard G. Suicide in Denmark: a statistical review for the past 150 years. Suicide Life Threat Behav 1980;6-10
10. Innov Clin Neurosci. Overwork Suicide in Japan, 2012:35–38


**Causes of suicides in world countries**
**Summary**

The topic is the first to describe suicide. It has since been touched on the causes of the general formation. The causes of suicide in the world and the statistical frequency are recorded. The article also mentioned which preventive measures are most important in this regard. Examples of suicides and examples of suicides have been examined in some countries around the world. In countries where the suicide rates are high, the causes are different and what measures are lacking. There was an opportunity to identify similar and different causes of suicide by country.

**Причины самоубийст в странах мира**
**Резюме**

В статье, в первую очередь, приводятся общие представления о самоубийстве. Далее рассмотрены причины самоубийства, приводятся статистические данные. В статье также упоминается, какие предупреждающие меры могут стать наиболее эффективными. Приводится опыт различных стран. Выявляется частота этого факта по странам, приводятся общие и различительные моменты, анализируются имеющиеся данные.

**Rəyçi: prof. R.Əhmədli**

Göndərilib: 29.04.2020 Qəbul edilib: 02.05.2020

**SİYASİ ELMLƏR POLITICAL SCIENCES ПОЛИТОЛОГИЯ**

DOI: 10.36719/AEM/2007-2020/53/161-163

**Турал Новруз оглу Исмайилзаде**
Бакинский государственный университет
infoismayilzade@gmail.com

# "COVID-19" КАК РЫЧАГ СОЦИАЛЬНО-ТЕХНОЛОГИЧЕСКИХ ИЗМЕНЕНИЙ

***Ключевые слова:*** *Covid-19, инфекционное заболевание, промышленная революция, Новый Мир, социальная изоляция, технологические парадигмы, цифровой мир, глобальные изменения*
***Açar sözlər:*** *Covid-19, infeksiyon xəstəliklər, sənaye inqilabı, Yeni Dünya, sosial izolyasiya, texnoloji ziddiyyətlər, rəqəmsal dünya, qlobal dəyişikliklər*
***Key words:*** *Covid-19, infectious disease, industrial revolution, New World, social isolation, technological paradigms, digital world, global change*

Коронавирус или как мы его называем - «COVID-19» – это инфекционное заболевание, вызванное новым, неизвестным вирусом. У большинства больных наблюдаются легкие симптомы, выздоровление происходит без специфического лечения. Но и есть некоторые больные, которые находятся в трудном болезненном состоянии и умирают от инфекции. [1]

Вирус передается через капли, выделяющиеся из дыхательных путей инфицированного человека при кашле, чихании или дыхании. Из-за своей массы эти капли не задерживаются надолго в воздухе и быстро оседают. Заразиться им можно воздушно-капельным путем, находясь в непосредственной близости от человека с COVID-19, или в результате переноса вируса руками с зараженной поверхности на слизистые оболочки глаз, носа или рта.

Конечно эта инфекция опасна для любого человека, но один из плюсов пандемии было возможность экспериментировать людей с технологиями в разных странах мира, что приведёт к возникновению безопасного, устойчивого и безбарьерного будущего.

В связи с пандемией человечество переживает такой период, что люди, организации и общества в целом испытывают сильное нано-технологическое давление, что ускоряет четвертую промышленную революцию. Явным примером можно назвать размывание границ между физическим, цифровым и биологическим миром людей. [2]

Чрезвычайное положение в четвертую промышленной революции вынуждает нас осознать необходимость структурной перестройки Нового Мира. Пандемия заставляет человечество оценить активное использование технологий 21 века или «Золотого тысячелетия»:

- ✓ ускоренное развитие искусственного интеллекта и интернета вещей;
- ✓ ускоренное развитие социальной медии на основе цифровых платформ и виртуальной (голограммной) реальности;
- ✓ ускоренное развитие и использование дронов и 3D-печати в разных сферах жизнедеятельности людей;
- ✓ ускоренное развитие и внедрение 5G технологий.

Такое развитие ведёт нас к тому, что люди ещё больше положились на новейшие технологии и заставляет изобретать новые способы использовать их для создания обшей экономической выгоды.

В нынешний день более 7 миллиардов людей по всему миру живут в условиях социальной изоляции и ограничения передвижения и более половины населения мира находятся в принудительном карантине. Хотя с психологической точки зрения они реально страдают от условий карантина, но вынужденно перешли в цифровую сферу деятельности, именно к тому, чему они сопротивлялись десятилетиями.

Сейчас на дистанционном обучении с помощью видеоконференций находятся полтора миллиарда учащихся или же половина населения мира онлайн проводят совместную работу. Организации осваивают технологии и развивают свои бизнес-модели, открывают для себя новые технические возможности.

Сейчас по всему миру во всех сферах деятельности применяются новые технологические парадигмы: проведение дистанционного обучения, виртуальное отслеживание состояния вируса. Используются нано-технологий в разработке наиболее перспективных вакцин, серийный выпуск с помощью

3D-печати десятки миллионов защитных масок и самое главное разработали контактное отслеживание смартфонов инфицированных людей.

Инновационный взрыв в период Covid-19 заставил человечество вступить на неизведанную территорию дигитального мира. Постепенно сформируются современные граждане Нового Мира – идентифицированные нано-существа, которые при помощи технологий с большим размахом переделывают окружающую среду под собственные нужды. Ученые и специалисты называют нынешнюю эру "антропоценом", в связи с тем, что человечество как доминирующая сила изменяет экосистему всей планеты. [3]

Главная глобальная проблема людей в условиях четвёртой технологической революции является проблема адаптации к нано изменениям. Специалисты утверждают, что не все люди в состоянии пережить такие изменения, а те, которые сумеют успешно адаптироваться, будут процветать в условиях ускоренной технической революции.

Глобальные изменения с лучшей стороны повлияло на состояние экологии. Рейчел Карсон (1907–1964), Донелла Медоуз (1941–2001), Дороти Стоуи (1920–2010), Гаура Деви (1925–1991), Франсуаза Добон (1920 –2005), Келли Петра (1947–2005), Вандана Шива (1952), Светлана Алексиевич (1948) и другие более ста лет боролись за сохранение экологического и улучшения состояния мира. И только сейчас, в период пандемии произошло резкое сокращение выброса углеводородов и озоновый слой начал «дышать». [4]

В этот период важным является стимулирование экономики, правительства многих стран стараются, чтобы в ходе нано-технологической революции дать людям новые профессии и поддержать тем самым мировую "зелёную экономику". [5]

На фоне распространения вируса команда «Stackline» показал нам список самых быстрорастущих товарных категорий e-Commerce в США и по всему миру за март 2020 в сравнении с мартом прошлого года. [6], [7]

Самые быстрорастущие категории товаров:

- ✓ одноразовые перчатки;
- ✓ хлебопечки;
- ✓ лекарства от кашля и простуды;
- ✓ готовые еды в упаковках;
- ✓ фруктовые наборы;
- ✓ консервированные супы;
- ✓ оборудование для фитнеса;
- ✓ интернет-покупки туалетной бумаги;
- ✓ бумажные полотенца;
- ✓ электрогенераторы;
- ✓ холодильники;
- ✓ мониторы и медицинские девайсы;
- ✓ витаминные добавки;
- ✓ краски для волос;
- ✓ компьютерные мониторы, мышки и клавиатуры;
- ✓ офисные стулья и другие.

Самых быстропадающие категорий товаров:

- ✓ «багаж и чемоданы» показала самый большой спад (-77%) в связи с тем, что люди не могут путешествовать, то и чемоданы им не очень нужны;
- ✓ фотоаппараты и камеры;
- ✓ свадебные платья;
- ✓ солнцезащитные очки;
- ✓ товары для кемпинга;
- ✓ товары для мероприятий и вечеринок;
- ✓ одежда и обувь.
- ✓ авиаперевозки, аэропортовая деятельность, автоперевозки;
- ✓ культура, организация досуга и развлечений;
- ✓ физкультурно-оздоровительная деятельность и спорт;
- ✓ деятельность туристических агентств;
- ✓ гостиничный бизнес;
- ✓ общественное питание;
- ✓ деятельность организаций дополнительного образования, негосударственных образовательных учреждений;
- ✓ деятельность по организации конференций и выставок;

DOI: 10.36719/AEM/2007-2020/52/196-198

**Lalə Əmrah qızı Fətəliyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
lalefataliyeva0@gmail.com

# KİÇİK MƏKTƏB YAŞLI OPTİK DİSQRAFİYALI UŞAQLARIN XÜSUSİYYƏTLƏRİ VƏ NÖVLƏRİ

***Açar sözlər:*** *disqrafiya, optik disqrafiya, literal optik disqrafiya, güzgülü disqrafiya*
***Key words:*** *dysgraphia, optical dysgraphia, literal optical dysgraphia, mirrow dysgraphia*
***Ключевые слова:*** *дисграфия, оптическая дисграфия, литеральная оптическая дисграфия, зеркальная дисграфия*

Kiçik məktəbyaşlı uşaqların yazı vərdişlərinin yaradılmasına oxu ilə bir vaxtda başlanılır. Hal-hazırda tipik uşaqların yazıya yiyələnməsi dörd mərhədə aparılır:

I mərhələ bələdləşdirici olub, böyük məktəbəqədər yaş dövrünü əhatə edir. Bu mərhələdə uşağa kağız vərəqi, karandaş və qələm ilə davranmaq bacarığı təlim edilir. Onda görmə analizatorunun, əlin hərəkətləri formalaşdırılır. Uşaq yazını ünsiyyət vasitəsi kimi anlamağa başlayır.

II mərhələ analitik mərhələ olub, məktəb təlimində əlifbaya qədər və əlifba mərhələsini əhatə edir. Bu mərhələnin özü də iki yarımmərhələyə ayrılır: hərf elementləri və onların birləşmələrinin yazılması zamanı motorikanın inkişafının baş verdiyi sadə (elementar) mərhələ və səsin hərflə əlaqələrinin möhkəmləndirildiyi yarımmərhələ.

III mərhələ analitik-sintetik (hərfdən sonrakı) mərhələdir. Bu mərhələ hərflərin hecalara, söz tərkibində birləşmələrinə keçidini təmin edir.

IV mərhələ sintetik (orta məktəb) mərhələsi olub, yazının texniki vərdişlərinin ikinci plana keçilməsi və yazının avtomatlaşdırılmasını əhatə edir. Bu mərhələdə əsas diqqət yazı zamanı fikrin ifadəsinə yönəldilir və yazı tam, kamil ünsiyyət vasitəsinə çevrilir.

Əvvəldə qeyd edildiyi kimi yazı bütöv əlin, əl əzələlərinin, bütün bədənin koordinasiyalı işini tələb edən çox mürəkkəb bir prosesdir. Yazıya hazırlıq məktəb təliminə hazırlığının ən çətin mərhələlərindən biridir. Bu ilk öncə uşağın həm psixo-fizioloji xüsusiyyətləri, həm də yazı prosesinin özünün xüsusiyyətləri ilə bağlıdır.

Məktəbəqədər yaş dövründə əlin xırda əzələlərinin tam formalaşmaması, hərəkət koordinasiyasının tam inkişaf etməməsi, müxtəlif məkanları qiymətləndirmə və fərqləndirmə bacarığının olmaması yazıya yiyələnmə mərhələsinin hazırlığını tələb edir.

Fizioloq və psixoloqların apardıqları müşahidələrə görə böyük məktəbəqədər yaşlı uşaqlarda məktəb öncəsi əlin xırda və ümumi motorikası zəif səviyyədə səviyyədə formalaşır, adətən buna səbəb bilək və barmaq bükümlərinin sümükləşmə prosesinin bitməmiş olmasıdır. Hərf və onun elementlərinin qavranılmasında və yazılmasında birbaşa iştirak edən görmə və hərəkət analizatorları inkişafın müxtəlif mərhələsində olurlar. Kiçik məktəbyaşlı uşaqların yazı təliminin başlanğıcında hərflərdə elementləri görmək bacarığı olmur. İbtidai sinif şagirdləri bütöv hərfdə onun elementlərini görmədikləri üçün, hərf konfiqurasiyalarını tam qavraya bilmirlər. Uşaqlar hərf strukturunda kiçik dəyişiklikləri müəyyən edə bilmirlər.

M.M.Bezrukovun fikrinə görə, yazı təlimin gedişində formalaşan ən böyük bacarıq komplekslərindən biridir. Yazı təlimində ən vacib element qrafo-motor yazı vərdişinin və onunla eyni vaxtda orfoqrafik vərdişlərin formalaşdırılmasıdır. Qrafik vərdiş dedikdə yazı səslərinin və onların birləşmələrini təsvir etməyə imkan verən, yazan əlin müəyyən hərəkət vərdişlərinin yaradılması nəzərdə tutulur. Düzgün formalaşdırılmış qrafik vərdiş hərfləri dəqiq, aydın, tez və gözəl yazmağa imkan verir. Düzgün formalaşmamış qrafik vərdiş yazıda çoxsaylı çətinliklərin yaranmasına: səliqəsiz, anlaşılmayan əlyazısı, yazı tempinin ləngliyi kimi qüsurlara gətirib çıxarır. Düzgün olmayan qrafik vərdişin düzəldilməsi isə çox çətin, bəzən də mümkünsüz olur. Qrafik vərdişlərin düzgün formalaşmaması uşaqlarda hərfin optik surətlərinin, görmə təsəvvürlərinin çatışmazlığı ilə bağlıdır.

Yazılı nitq pozulmalarını araşdıran tədqiqatçılar optik disqrafiyanın müxtəlif cür təzahürlərini və spesifik səhvlərin növlərini fərqləndirmişlər. O.A.Tokarevanın fikrinə görə optik disqrafiya görmə təəsəvvür və anlayışlarının davamsızlığı ilə şərtlənir. Ayrı - ayrı hərflər uşaq tərəfindən tanınmır, müəyyən səslərlə uyğunlaşdırılmır və müxtəlif anlarda müxtəlif cür qavranılırlar. Görmə qavranılmasının qeyri-dəqiqliyi nəticəsində hərflər yazıda qarışdırılır. Hərflərin qarışdırılması daha çox bu hallarda özünü göstərir: [i-ı], [u-ü], [ğ- g], [b-d], [ ç-c], [ f –r] .

M.E.Xvatsev belə hesab edirdi ki, optik disqrafiya baş beyində nitqin optik sistemlərinin formalaşmasının pozulması və ya formalaşmaması ilə bağlı meydana çıxır və bunun nəticəsində hərfin, sözlərin görmə surətlərinin formalaşması pozulur və insan oxşar qrafik simvolları: [ ğ- g], [b-d], [ç-c], [f –r] fərqləndirməkdə çətinlik çəkir.

Çox zaman qrafik cəhətdən əlyazması oxşar hərflər: eyni elementlərdən tərtib edilmiş, lakin fərqli məkanda yerləşmiş [ğ- g], [b-d], [ç-c] hərflər; eyni elementlərdən, lakin fərqli əlavə elementlərdən tərtib edilmiş hərflər [f- t], [i –j], [q – g]; güzgülü yazılan hərflər [e, ə, s, k] qarışdırılır. Optik disqrafiyanın ağır hallarında sözlərin yazılması tam mümkünsüz olur. Uşaq yalnız ayrı-ayrı hərfləri yazırlar, bəzi hallarda isə, xüsusilə solaxaylarda güzgülü yazı, yəni hərflərin elementlərinin soldan sağa deyil, sağdan sola yazılması müşahidə edilir.

Optik disqrafiyanın simptomatikasında literal, verbal və güzgülü optik disqrafiyanı fərqləndirirlər.

Literal disqrafiya zamanı uşaqlarda hərflərin görmə surətləri pozulur, onlarda hərflərin təhrif olunması, təcrid olunmuş hərflərin əvəz edilməsi müşahidə edilir. Literal optik disqrafiya zamanı uşaq hərfləri tanımaqda, onları ayrılıqda yazmaqda belə çətinlik çəkir.

Optik disqrafiya - sözlərin yazılması zamanı hərflərin optik xarakterli təhrif olunmasıdır. Verbal optik disqrafiya zamanı hərflər ayrılıqda mühafizə olunur, yəni düzgün yazılsa da, sözün görmə surətləri çətinliklə və kobud səhvlərlə formalaşır.

Tədqiqatçıların apardığı müşahidələrə görə disqrafiyanın bu forması kiçik məktəbli yaşında psixi inkişafı ləngiyən uşaqlarda daha çox özünü göstərir. Bu psixi inkişaf ləngliyi olan uşaqların məkanda bələdləşmə, görmə qavraması və görmə - motor koordinasiyasının aşağıdakı xüsusiyyətlərinin olması ilə şərtlənir:

- Məkani təhlil və tərkib zamanı meydana çıxan çətinliklər;
- Görmə surətlərinin davamsızlığı;
- Məkanda koordinasiya - oriyentasiya çətinliyi;
- Elementlərin uyğunluğunun pozulması.

Psixi inkişafı ləngiyən uşaqlar qeyd edilən yazı prosesinin pozulması zamanı ayrı - ayrı hərfləri tanınmır və onları müəyyən səslərlə uyğunlaşdıra bilmirlər. Lakin bəzi hallarda hərflər uşaqlar tərəfindən müxtəlif cür qavranıldığından yazıda görmə qavramasının pozulması nəticəsində onları qarışdırılırlar. Psixi inkişafı ləngiyən kiçik məktəb yaşlı uşaqlarda optik disqrafiyanın ağır halları da müşahidə olunur. Bu zaman uşaqlar yalnız ayrı - ayrı hərfləri yaza bilir, lakin sözlərin yazılması mümkünsüz olur. Qeyd etmək lazmdır ki, psixi inkişafı ləngiyən uşaqlarda optik disqrafiya uşağın şifahi nitqinin vəziyyəti ilə bağlı olmur.

T.V.Axutina optik disqrafiyalı psixi inkişafı ləngiyən uşaqlarda yazının aşağıdakı xüsusiyyətlərini fərqləndirmişdir:

- dəftər vərəqində bələdləşmənin, sətrin gözlənilmə və sətrin başında olma çətinliyi;
- hərflərin ucalıq və əyilməsinin müəyyənləşdirmə çətinliyi, hərfin ölçülərinə
onun elementlərinin uyğunsuzluğu;
- görmə surətlərinə görə oxşar, yazılışına görə yaxın hərflərin əvəzlənməsi;
- hərflərin güzgülü yazılması;
- sözlərdə hərf, cümlələrdə söz sırasının pozulması;
- vahid söz surətinin fərqləndirilməsi zamanı meydana çıxan çətinliklər.

Bunun nəticəsində sözlər köməkçi sözlərə birləşdirilir, şəkilçilər sözlərdən ayrı yazılır. Yazılışına görə oxşar hərflər bir -birindən aşağıdakı əlamətlərə görə fərqləndirilir:

- eyni elementlərin mövcudluğu ilə; [i- ı], [u-ü], [o-ö], [c-ç], [s-ş],
- əlavə elementlərin olması ilə: [i- ı], [c-ç,] [s-ş], [g-ğ],
- elementləri ölçülərinə görə: [p], [b], [d],
- hərf elementlərinin məkanda yerləşməsinə görə

Yuxarıda qeyd edilənlərlə yanaşı psixi inkişafı ləngiyən kiçik məktəb yaşlı uşaqların yazısında aşağıdakı çatışmazlıqlar da müşahidə edilir:

- Hərf elementlərin sayının nəzərə alınmaması: [ç - c], [f - t], [ü - u], [k - z];
- Hərflərə əlavə elementlərin yazılması: [l- h], [q-g];
- Məkanda b, d, z, v hərflərinin düzgün yerləşdirilməməsi
- Hərflərin güzgülü yazılışı: [e-ə], [b- d];
- oxşar hərflərin əvəz edilməsi: [i- ı], [e-ə], [b- d], [c-ç], [s-ş], [g-ğ];

Kiçik məktəb yaşlı uşaqlarda optik disqrafiyanın literal,verbal və güzgülü yazı növlərinə çox rast gəlinir.

Literal disqrafiya zamanı uşaqda hərflərin görmə obrazları pozulur, hərflərin təhrif edilməsi və ayrılıqda əvəzlənməsi müşahidə olunur. Verbal disqrafiya zamanı isə hərflərin ayrılıqda yazılışı saxlanılır, lakin onların

görmə obrazı çətinliklə formalaşır, uşaq sözləri kobud səhvlərlə yazır. Güzgülü optik disqrafiya bəzən soləlli uşaqlarda, həmçinin baş beynin üzvü zədələnmələri zamanı müşahidə edilir.

Beləliklə də, optik disqrafiya görmə qnozisi, təhlil və tərkib, həmçinin məkani təsəvvürlərin pozulması ilə şərtlənmiş yazı qüsuru hesab edilir. Çox saylı tədqiqatçıların müşahidələrinə görə disqrafiyanın bu növü daha çox psixi inkişafı ləngiyən kiçik məktəb yaşında olan uşaqlarda özünü göstərir, müəyyən görmə qavrayışı görmə-motor koordinasiya və məkanda bələdləşmə xüsusiyyətləri ilə bağlı olur. Psixi inkişafı ləngiyən kiçik məktəb yaşlı uşaqlarda optik disqrafiyanın simptomatikası çoxcəhətli olub, hərflərin ən yüngül təhrifi və əvəz etmələrindən söz və cümlələrin yazıda mümkünsüzlüyünə kimi özünü göstərə bilər.

**Ədəbiyyat**

1. Ахутина Т.В. Нарушение письма: диагности ка и коррекция. Спб., 2004.)
2. О.О.В. Правдина логопедия. Из. Во. Просвещение.2002.
3. Л.С.Волкова, Логопедия. 2007
4. Е.В.Мазанова, Коррекция аграммамической дисграфии. М., 2006
5. К.П.Беккер, М.Совак, Логопедия. М., 2001.

**Characterictics and types in primary school age children with optical dysgraphia**

**Summary**

Symptoms of optical dysgraphia in young school-age children are multifaceted and can manifest themselves at different levels. Literal, verbal, and mirror types of optical dysgraphia are common in these children. In literal dysgraphia, the child's visual images of letters are distorted and letters are distorted and replaced. In verbal dysgraphia the spelling of letters is preserved, but its visual image is difficult to form, children make serious mistakes in words. Mirror optical dysgraphia manifests itself as writing the elements of letters from right to left instead of from left to right.

**Особенности и типы оптической дисграфией у детей младшего школьного возраста**

**Резюме**

У детей дошкольного возраста симптомы оптической дисграфии многогранны и могут выражаться на разных уровнях. Среди этих детей зрительные дисграфии типа литеральная, вербальная и зеркальная дисграфия. При буквальном расстройстве письма визуальный образ букв ребенка будет искажен, а буквы также будут деформированы и заменены. Вербальная дисграфия написание буквы сохраняется, однако с большим затруднением формируется образ букв, и ребёнок допускает грубые ошибки к письме. А что косается зеркального письма,то оно проявляется в основном у левшей и письмо бывает ни слево на право,а справа на лево.

**Rəyçi:: p.f.d. S.Aslanova**

Göndərilib: 23.04.2020 Qəbul edilib: 27.04.2020

DOI: 10.36719/AEM/2007-2020/53/199-201

**Qəndab Asif qızı Mustafayeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
qendab.hilalli@mail.ru

# MƏKTƏBƏQƏDƏR YAŞLI DİSLALİYALI UŞAQLARDA DİLİN QRAMMATİK TƏRƏFLƏRİNİN FORMALAŞDIRILMASI ÜZRƏ İŞİN MƏZMUNU

***Açar sözlər:*** *differensial diaqnostika, dislaliya, dizartiya komponenti, məktəbəqədər təhsil, korreksiya pedaqogiyası*
***Ключевые слова:*** *дифференциальная диагностика, логопедия, дислалия, дизартрический компонент, дошкольное образование, коррекционная педагогика*
***Key words:*** *differential diagnostics, dyslalia, dysarthria component, preschool education, correctional pedagogy*

Alimlər və müəllimlər qeyd edirlər ki, minimal dizartiya pozulmalarıilə mürəkkəb dislaliya arasında çox böyük oxşarlıq var. Ancaq dizartriyada səs tələffüzünün korreksiyası müəyyən çətinliklərə səbəb olur. İlk dəfə nitq pozulmaları xəstəlikləri sahəsində tanınmış mütəxəssis Alman həkim Qerman Qutsman, buna diqqət yetirmişdir. O qeyd edirdi ki, bu pozulmalar bulanıqlıq, artikulyasiyanın pozulmasıilə xarakterizə olunur.

Nitqinfonetik tərəfinin pozulmalarınınaradan götürülməsi üzrəvə loqopedik işdə maksimal nəticələr əldə etməkvə adekvat korreksiyametodlarını seçmək üçünxarici əlamətlərinə görə bənzər,lakin fərqli mexanizmlərə malik pozulmuş dizartriya və dislaliyanımüəyyənləşdirməkdən ötrüdifferensial diaqnostika aparmaq lazımdır.

Loqopedik praktikadadifferensial diaqnostikaoxşar simptomatikası olan, lakin səbəblərinə və mexanizminəvə korreksiyaedici təsir taktikasına görə fərqlənənnitq pozulmalarının bir-birindən fərqləndirilməsi prosesidir.

Dizartriyanın silinən formalarını mürəkkəb dislaliyadan ayırd etmək üçün differensial diaqnostikanın yerinə yetirilməsi ardıcıllığı beləmüəyyənləşdirilir: əvvəlcə anamnestik məlumatlar təhlil edilir, sonra uşaqların hərtərəfli müayinəsi aparılır və müayinə parametrləri müəyyənləşdirilir. Aşınmış dizartiyanıvə dislaliyadanfərqləndirməyə imkan verən müayinə parametrlərinə aşağıdakılar daxildir:

- uşağın psixoloji xüsusiyyətləri;
- eşitmə funksiyasının vəziyyəti: eşitmə diqqəti, nitq qavrayışı;
- Görmə qavrayışının vəziyyəti, məkan praksisi;
- ümumi motorikanın vəziyyəti; əl hərəkətliliyinin vəziyyəti;
- artikulyasiya motorikasının vəziyyəti;
- üz əzələlərininişi;
- Artikulyasiya aparatının periferik şöbəsinin anatomik quruluşu;
- səs tələffüzünün vəziyyəti;
- tənəffüs və səs funksiyasının vəziyyəti;
- nitqin prosodik komponentlərinin vəziyyəti;
- fonematik funksiyaların vəziyyəti;
- Söz ehtiyatının, qrammatik quruluşun və rabitəli nitqin vəziyyəti. Diaqnoz qoyarkən hərtərəfli müayinə üçün vacib şərtlərdən biri də loqopedin, defektoloqun və nevroloqun hərəkətlərinin ardıcıllığıdır.

Uşağın müayinəsinə başlamazdan əvvəl, çox dəqiqliklə onun ana bətnində inkişafda olduğu vaxtın anamnestikməlumatlarını öyrənmək lazımdır. İnkişaf dövründən başlayaraq (anahamiləlik dövründətoksikoz, psixotravma, arterial hipertansiyon, tənəffüs xəstəlikləri, nevropatiya, xəsarət almışmı, doğuşun necə baş vermiş (vaxtında, uzadılmış və ya sürətli)) vəApgar cədvəlində yeni doğulmuş uşağa hansı dərəcəli qiymət verilmişdir.

Loqopedik müayinəyənitqəqədərki dövrün, erkən nitq və uşağınmüayinəyəyə keçirilənzamanaqədərki psixi inkişafının xüsusiyyətləri barədə məlumatları datoplamağı əhatə edir. Tibbi sənədlərin məlumatları və valideynlərlə söhbətlər, sözləri deməyə başladığı vaxt müəyyənləşdirilir.

Uşaq nevropatoloqu ilə birlikdə bir loqoped, uşağın ümumi motor bacarıqlarının xüsusiyyətlərini (baş tutma, yan tərəfə sərbəst dönmə, oturma, dik durma, müstəqil gəzinti, yeriş xüsusiyyətləri) və əllərin və

barmaqların necə işləməsini (dəstək funksiyası, xurma və barmaq tutuşu, aparıcı əlin seçilməsi, əllərin hərəkətlərinin əlaqələndirilməsi, incə fərqlənmiş barmaq hərəkətləri) öyrənir.

Aparıcı əzələlərdə və motor bacarıqlarında (nitq-motor sindromu) aparıcı nevroloji sindromu və təzahür dərəcəsini təyin edərkən, loqopednevroloqun nəticəsinə güvənir. Loqopedin müayinəsi zamanı uşağın tamamilə sakit olması, ağlamaması, qorxmaması, bunun əzələ tonunun dəyişməsinə (artmasına) təsir göstərməsi vacibdir, nəticədə danışma terapevti mövzunun motor və nitq qabiliyyətləri barədə yanlış fikir alacaqdır.

Şiddətli motor pozulmasıolanuşağı rahat bir divana və ya xalçaya qoymaq, fərqli mövqeləri yoxlamaq - kürəkləri və yanları üstündə, qarın üstə yatıraraq yoxlamaq olar. Daha yüngül hallarda müayinə "oturma" və ya "duruş" vəziyyətdə aparılır. Artikulyasiya aparatının müayinəsi onun orqanlarının quruluşunu (dodaqlar, dil, dişlər, sərt və yumşaq damaq, çənə), istirahətdə və aktiv nitq fəaliyyətində əzələ tonusunun vəziyyətini yoxlamaqdan başlayır. Dizartiya olan uşaqlarda artikulyar əzələlərin tonusu spastiklik, hipotenziya və ya distoniya ilə xarakterizə edilə bilər.Tez-tez artikulyar aparatdakı əzələ tonusunun pozulmasıqarışıq və dəyişkən xarakterdaşıyır.(məsələn, hipotansiyon üz və labial əzələlərdə, dilli əzələlərdə spastiklik ilə ifadə edilə bilər). Bu zaman Hipomimiyanin olması və ya olmaması, üzün asimmetriyası, nazolabial katlanmaların hamarlığı, sinkinesiya, üz və dilli əzələlərin hiperkinesiyası, dilin titrəməsi, dilin yan tərəfə sapması (sapması) və hipersalivasiya ola bilər.

Bu zaman, sözlərin, hərəkətlərin, sadə və mürəkkəb süjetlərin, leksik və qrammatik quruluşların və hadisələrin ardıcıllığının mənalığı müəyyənləşdirilir. Ekspressiv nitqi araşdırarkən uşağın nitq inkişaf səviyyəsi aşkarlanır. Nitqin leksik və qrammatik cəhətlərinin yaşa bağlı formalaşmasını, nitqin müxtəlif hissələrinin mənimsənilməsini və sözlərin xüsusi heca quruluşunu qeyd etmək vacibdir. Danışmayanuşaqlar müxtəlif qeyri-verbalünsiyyət vasitələrindən istifadə etmək imkanına malikdirlər: ifadəlimimiklər, jestlər, intonasiya.

Nitqin tələffüz tərəfini öyrənərkən nitq aydınlığının pozulma dərəcəsi aşkar olunur (başadüşülməyən nitq , az başadüşülən nitq; nitq aydınlığı birazdüşmüş,qeyri-səlisnitq, bulanıqnitq). Nitqin fonetik-fonematik quruluşu ətraflı şəkildə yoxlanılır. Səs tələffüzü araşdırılarkən uşağın səsləri təcrid, hecalarla, sözlə, cümlələrdə və xüsusilə nitq axınında tələffüz etmək qabiliyyətini müəyyənləşdirmək lazımdır.

Səs tələffüzünün çatışmazlıqlarının xarakterini qeyd etmək lazımdır: təhrif, dəyişdirmə, səslərin buraxılması. Səs tələffüzünün pozulması fonemik qavrayışı və səs analizinin xüsusiyyətləri ilə müqayisə olunur.Loqopedikmüayinənin məlumatlarını təhlil edərək, uşağınaşkar olunan pozulmaları hansı qrupa aid olduğunu müəyyən etmək lazımdır: "sırf"fonetik, fonetik-fonematik qrupunavə ya ümumi nitq inkişafının ləngiməsi qrupuna.

Daha sonra, nəfəs pozulmalarının (səthi, sürətli, qeyri-ritmik), səs pozulmalarının(səsin gücünün olmaması və səs tembrinin sapması) və nitq axınının prosodik təşkilixüsusiyyətlərqeyd edilir. Diaqnostikaərzində dizartriya komponenti olan uşaqların idrak sahəsinin inkişaf xüsusiyyətlərini təhlil edəcək loqopedilə defektoloq arasındakı qarşılıqlı əlaqənin olması vacibdir.

Defektoloq, idrak fəaliyyətinin (düşüncə, diqqət, yaddaş) inkişaf xüsusiyyətlərini, sensorfunksiyalarını (görmə, eşitmə və kinestetik qavrayış), emosional-iradisferanın təzahürlərini qiymətləndirməyə kömək edər. Korreksiyapedaqogikasınöqteyi-nəzərindən, dilin fonematik sisteminin formalaşmaması, uşağın sonrakı təhsilində savadlı oxu və yazınımənimsəməyə qarşı duran əsas maneədir.

Uşaqlara oxumağı və yazmağı öyrətməyin zəruri şərti, nitq qüsurlu uşaqlarda normadan geri qalan və bir sıra xüsusiyyətlərlə xarakterizə olunan (ətraf mühit haqqında təsəvvürlərin yoxsulluğu, söz anlayışının yavaş inkişafı, məkan, mövzu şəkillərinin pozulması) görməqavrayışınıninkişaf etdirilməsidir.

Yaddaşın pozulmasıçoxəhəmiyyətli bir əlamətdir. Dizartiyalı uşaqlarda, bəzəngörmə yaddaşının çox aşağınəticələri olduğu ortaya çıxır. Bu həm görmə qavrayışınınpozulması, həm də zəif məkan təsəvvürləri zəifliyi ilə əlaqədardır.

Bu, bir sıra həndəsi fiqurları yadda saxlamağalazım olarkən özünü göstərir. Qeyd etmək lazımdır ki, yaddaşın səviyyəsi, xüsusən də eşitmə yaddaşının səviyyəsini, nitqin inkişaf səviyyəsinin azalması ilə aşağı düşür.Dizartiya komponenti olan uşaqlarda diqqət bir sıra xüsusiyyətlərlə xarakterizə olunur: qeyri-sabitlik, bir hadisədən digərinə keçiddə çətinlik, ixtiyaridiqqətin azlığı və s.

Beləliklə, artan həyəcanlanma nəticəsində dizartiya olan uşaqlarınuzun müddət davam edən gərginliyə, yorğunluğa, xüsusən intellektual fəaliyyətlə dözümləri yoxdur.Zehni fəaliyyət baxımından dizartiyası olan uşaqların kontingenti son dərəcə müxtəlifdir. Bəziləri normal inkişaf edən həmyaşıdlarına yaxındır, digərləri əksəriyyət həmyaşıdları kimiidrak fəaliyyəti aşağı səviyyəsi ilə xarakterizə olunur.

Hərəki və sensorpozulmalarsəbəbindən əyani - məntiqi təfəkkürün formalaşması ləngiyir.

Nitqin inkişafındakı gecikmə təxəyyülün inkişafının dagecikməsinə"şərait" yaradır. Belə uşaqlarqeyri-kafisəviyyədə hərəkətlilik, süstlük və təxəyyülproseslərinin tez tükənməsi ilə xarakterizə olunurlar. Onlardaəqli əməliyyatlarda qeyri-çeviklik, düşüncə və təxəyyül proseslərinin qeyri-kafi plastikliyi, yaradıcı

məhsulların məzmununun emosional yoxsulluğu kimiəlamətlər gözə çarpır.Bu nitq pozulmaları olanşəxsiyyətin formalaşmasına mənfi təsir göstərir, emosional - iradi sferanın spesifik xüsusiyyətlərinin yaranmasınasəbəb olur.

Dizartiya olan uşaqlarda emosional- iradipozulmalar artan emosional həyəcan və sinir sisteminin tükənməsi şəklində özünü göstərir. Bəziləri qıcıqlanmaya meyllidirlər, hərəkət cəhətdənnarahatdırlar, tez-tez kobudluq, itaətsizlik göstərir, digərlərinəmane olur, utancaq olur, çətinliklərdən qaçır və dəyişən vəziyyətlərə zəif uyğunlaşır. Uşaqların böyük əksəriyyətitəşəbbüskar deyillər, başqalarından asılılıq ilə xarakterizə olunur, bəzilərində zəif inkişaf etmiş ara- məsafə hissi lazımi səviyyədə deyildir.

Xarakteroloji və patoloji reaksiyalar etiraz, uğursuzluq təbiətindədir. Özlərinə inamsız, əsəbi olduqları üçün, çox vaxt normal danışan həmyaşıdları iləpis münasibətdə olurlar və özlərinə qapılırlar. İnsanın sosial adaptasiyası prosesinin ayrılmazhissəsi psixoloji xüsusiyyətlərin və davranış formalarının cəmini müəyyən edən sosial-roldavranışıdır. Nitqçatışmazlıqları olan uşaqların emosional-iradi, şəxsi sferalarındakıpozulmalariş qabiliyyətini aşağı salır ki,bu da öz növbəsində, onların biliklərinin keyfiyyətinə mənfi təsir göstərir.

### Ədəbiyyat

1. N.T.Hüseynova,T.H.Ağayeva "Loqopediya"Bakı-2017
2. Z.M.Əzizova, R.Q.Cəfərova, Ş.N. İsmayılov "Loqopediyanın nəzəri əsaslarıhaqqında ümumi məlumat"Mingəçevir – 2008
3. Бородич А.М. Методика развития речи детей, М., «Просвещение», 1981 г.

### Content of the work on the formation of grammar sides of language in preschool children with dislaly

**Summary**

The article provides a brief description of specific speech disorders (dyslalia and dysarthria) in preschool children. The article draws attention to the similarity of speech symptoms during diagnosis, presents the stages of diagnostic examination and describes the cognitive areas of preschool children with speech disorders. The article describes the important specific factors that allow to accurately give the results of speech therapy.

### Содержание работы по формированию грамматических аспектов языка у дошкольников с дислексией

**Резюме**

В статье дается краткое описание конкретных нарушений речи (дислалия и дизартрия) у детей дошкольного возраста. В статье обращено внимание на сходство речевых симптомов при постановке диагноза, представлены этапы диагностического обследования и описаны когнитивные сферы дошкольников с нарушениями речи. В статье описаны важные специфические факторы, позволяющие точно дать результаты логопедической терапии.

**Rəyçi: p.f.d. M.Məlikov**

DOI: 10.36719/AEM/2007-2020/53/202-204

**Yaqut İbrahim qızı Abduləliyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
yaqut.abdulaliyava@mail.ru

# KƏKƏLƏMƏNİN ETİOLOGİYASI VƏ PATOGENEZİ

***Açar sözlər:*** *kəkələmə, nitq qüsurları, loqoped, psixoloji problem*
***Key words:*** *stuttering, speech defects, logopedic, psychological problems*
***Ключевые слова:*** *заикание, дефекты речи, логопедия, психологические проблемы*

Kəkələmə müasir dövrün aktual problemlerindən biridir və nitqin tempo-ritmik hissəsinin pozulması ilə şərtlənir. Kəkələmə nitq patologiyası olaraq, bir fizioloji bütünlük kimi qıcolmalar nəticəsində ani yaranan artikulasiya aparatının pozulmasıdır. Qədim dövrlərdə Hippokrat kəkələməni baş beyində iltihabın çoxalması ilə, Aristotele isə artikulyasiya üzvlərinin düzgün olmayan quruluşu ilə izah edirdilər. Mərkəzi və ya periferik nitq aparatı şöbələrindəki pozulmaların kəkələmə ilə nəticələnməsi fikrini Qalen, Sels, İbn Sina kimi mütəfəkkirlər irəli sürmüşdürlər. XVII–XVIII əsrlərdə kəkələməni periferik nitq aparatının natamamlığı ilə izah etməyə cəhd göstərmişlər.Santorani hesab edirdi ki, kəkələmə sərt damaqda olan dəlikdən seliyin dilə süzülməsi nəticəsində nitqin çətinlişməsindən yaranır. Butserə görə isə alt çənədə qeyri – normal çökəkdə dilin ilişməsi kəkələməni yaradan səbəblərdən biridir.Erve-de-Şequanın gəldiyi nəticəyə görə kəkələmə ya dil altı pərdənin qısa olmasından, ya da dilin uzunluğu ilə ağız boşluğu arasında uyğunsuzluğun olmasından irəli gəlir.

Kəkələmənin əlamətləri tam olaraq ilk dəfə İ.A.Sikorskinin "Kəkələmə" (1889) adlı əsərində əks edilmişdir. İlk dəfə kəkələmə 1937-ci ildə təsnif edilmişdir. Səhiyyə Nazirliyinin İctimai Səhiyyə və İslahatlar Mərkəzinin açıqladığı məlumatda bildirilir ki, Ümumdünya Kəkələmə Günü Kanadanın Nitq patologiyası və Audiologistlərinnin təşəbüssü 1998-ci ildən başlayaraq hər il oktyabrın 22-də dünyada Beynelxalq Kəkələyənlər Günü kimi qeyd edilir. Kəkələmə ilə bağlı bir çox alimlər fikirlər irəli sürmüş və öz təqdiqtlarında bundan istifadə etmişdilər. Bunlara; V.S.Koçerginanı, N.A.Vlasovanı, İ.Sikorskyi, V.Şklovskiyi, E.Xvatsev, M.Zeyman, Y.Freşels, N.P.Tyapuqin, S.S.Lyapidevski və s. aiddir. 1928-ci ildə M.E.Şubert epileptoid psixopatialarda, astenik bədən quruluşlu xəstəliklərdə (astenik-atletik tipdə) Şizoid şəxslərdə, isterik xəstələrdə və sikloid komponentli şəxslərdə kəkələməni tədqiq etmişdi. M.S.Lebedinskaya, F.R.Yanoviç və Q.P.Platonova 1960-cı ildə nevrozun müxtəlif formalarında: psixopat və şəxsiyyətin pataloji inkişafı olan şəxslərdə, mərkəzi sinir sisteminin müxtəlif üzvü zədələnmələrində, kəkələməni araşdırmışlar. Kəkələmə adətən erkən yaşlarda və böhran dövlərinə keçən zaman yaranır. Dünya əhalisinin təxminən bir faizi kəkələmədən əziyyət çəkir. Bu problemə daha çox oğlanlar arasında rast gəlinir və 2-7 yaş dövründə daha aktiv hiss edilir.

Kəkələmənin tam yaranma səbəbi dəqiq məlum deyil, eyni zamanda kəkələmənin yaranma səbəblərinin müxtəlif olduğu bildirilir. Bəzi araşdırmalar irsin və ya stressin buna yol açdığını deyir. Q.D.Netkaçev 1909-cü ildə kəkələmə problemini tədqiq edərkən, onu yaradan səbəb kimi ailədə uşağın düzgün tərbiyə edilməsinin - həddən artıq əzizləmə və ya sərt münasibəti göstərmişdir.Avropa tədqiqatçıları kəkələmənin səbəbləri kimi düzgün olmayan tərbiyə, yoluxucu xəstəliklər, yamsılama, solaxaylıq, qorxu və müxtəlif zədələnmələri qeyd etmişdir. Beləliklə də, kəkələmənin etiologiyasında – ekzogen və endogen amillərin birgə şəkildə iştirakı göstərilir. Əsasən hamilə vaxtı ananın travma alması, qorxu, şiddət və güclü həyəcan problemin yaranma səbəblərindən biridir. İlkin olaraq kəkələməyə "uşaq xəstəliyi"ndeyilir lakin, kəkələmə ilkin uşaqlıq dövründə yaranmayıb, böyüdükdən sonrada yarana bilər. Kəkələyən uşaqlarla iş uzunmüddətli olur.Bunun üçündə kəkələyən uşaqlarla aparılan reabilitasiya işi fərdi xarakter daşıyır. Kəkələmənin yayılması yaş, cins, ətraf və digər faktorlarla şərtlənir. Kəkələmə nitqin funksional sistemlərnin intensiv inkişaf etdiyi və uşaq şəxsiyyətinin formalaşma mərhələsində baş verir. Sonra kəkələməyə meyl tədricən aşağı düşür və bir müddət sonra yenidən baş qaldıra bilər. Bir çox hallarda kəkələmə problemi kəkələyən şəxslərin sosial fəaliyyətlərinə təsir göstərir. Bəzən ünsiyyət çətinlikləri belə şəxslərin yalnız xüsusi fəaliyyətlərində baş verir. Məsələn, telefonda danışarkən və ya böyük qruplar qarşısında çıxış edərkən kəkələyirlər. Bundan başqa, əksər kəkələyən şəxslər evdə, məktəbdə və ya işdə bir sıra fəaliyyətlərdə çətinliklər yaşayırlar. Ona görə də hətta bəzi sosial fəaliyyətlərini məhdudlaşdırırlar. Çünki ətrafın onlara qarşı mənfi reaksiyasından narahatlıq keçirirlər, onlarda özünə qapanıqlıq yaranır. Cəmiyyətin kəkələyən adamlara yanlış münasibəti ümumilikdə insan həyatına və onun emosional vəziyyətinə ciddi təsir göstərir, bu

da çox vaxt stressə və özünəqapanmaya səbəb olur. Kəkələyən uşaqlar təəssüf ki, əksər hallarda istehza hədəfinə çevrilir.

Kəkələyən şəxslər adətən kütləvi çıxışlarda,məktəbdə lövhə arxasında dərs danışarkən kəkələyir. Bir sözlə stress vəziyyətində olduqda kəkələyən şəxslərdə kəkələmə artır. Bu problem uşaq vaxtı aradan çıxsada, yeniyetmə dövründə yenidən geri qayıda bilər [4, s. 56].

Bu günə kimi tibbdə kəkələmənin inkişaf etmə mexanizmi dəqiq təyin olunmayıb. **Kəkələmənin inkişaf etmə səbəbləri arasında:**

- uşağın baş beyinin funksiyalarının müxtəlif səbəblərə görə (doğuş travması, asfiksiya, baş-beyin travmaları - beyinin silkələnməsi və s., beyini zədələyən infeksiyaların keçirilməsi və s.) pozulması;
- hamilə vaxtı ananın travma alması,
- ağır psixoloji travmalar - güclü qorxu (və ya bəzən güclü sevinc), valideynlərlə (adətən ana ilə) ayrılıq və s.
- uşağın psixikasına mənfi təsir edən, uzunsürən vəziyyətlər - valideynlərin arasında olan və tez-tez təkrarlanan münaqişələr,
- informasiya ilə artıq dərəcədə yüklənmə (uşaqlar eyni zamanda bir neçə inkişaf dərnəklərinə yazılır; onlara eyni zamanda bir neçə dil öyrədilir və s.),
- ailədə poliqlossiya - ikidillilik (məsələn, valideynlər ikidilli olduqda) və s.
- solaxay uşaqları sağ əli ilə yazmağa öyrətmək də kəkələməyə təkan verə bilər.
- irsi,genetik faktorlar
- mərkəzi sinir sisteminin üzvi zədələnməsi,
- keçmiş zehin travması;
- nitqin formalaşmasının ümumi prosesindəki xüsusiyyətlər,
- infeksiyon xəstəliklər keçirməsi,
- qorxu, şiddət və güclü həyəcan ,
- bəzən kəkələmə uşaqlarda özünü kəkələyən ailə üzvünə bənzətmə reaksiyası kimi inkişaf edir. Lakin bu halda da uşaq müalicə olunmalıdır.

Kəkələmə əsasən uşaq cəzalandırıldıqdan sonra üzüntüdən,sarsıntıdan sonra güclənə bilər. Kəkələməni törədən səbəbləri ekzogen (xarici) və endogen (daxili) təsirlərin yekun nəticəsi kimi görürdülər. Müasir zamanda kəkələmənin səbəblərini iki yerə bölmək olar:

1. Meyl etdici (əsas), beyin zədələnməsi, emosional gərginlik və həssaslıq, qorxular, infeksion, somatik, nervroloji xəstəliklər və s.)
2. Yaradıcı (təkan) səbəblər.

M.E.Xvatsev, İ.P.Tyapuqin, M.S.Lebedinski, S.S.Lyapidevski və başqaları kəkələməni nevrozun bir forması, J.A.Florenskaya, J.A.Povarinski və digərləri isə onu nevrozun əlaməti kimi tədqiq etməyə başladırlar.

Kəkələmənin kliniki cəhətdən təsnifatı V.S.Koçergina (1959), N.A.Vlasova (1958) və başqalarının elmi əsərlərində əks olunmuşdur. Məsələn,V.S.Koçergina bunu aşağıdakı qruplara ayırmışdır:

- birinci qrupa,kəkələmə nəticəsində davranışlarında pozulmalar olan uşaqları ,
- ikinci qrupa,erkən yaş dövründə davranışlarında pozulmaların onların şəxsi fərdi keyfiyyətləri olan uşaqları,
- üçüncü qrupa, yüksək oyanması olan, ana bətnində mənfi təsirə məruz qalan, doğuş travmaları alan, somatik və yoluxucu xəstəliklərə yoluxan uşaqları,
- dördüncü qrupa isə, ağır nevroz əlamətləri və isterik reaksiyaya meyilli olan uşaqları aid etmişdir [1, s.178].

Alimlər kəkələmənin üç əsas səbəbini qeyd edirlər:

Birinci səbəb - məlumdur ki, kəkələmə çox vaxt irsən keçir. Valideynlərin birində və ya yaxın qohumlarda kəkələmə varsa irsən keçə bilər. Kişilərdə qadınlara nisbətən daha çox rast gəlinir.

İkinci səbəb - sinir sisteminin irsi xüsusiyyətidir. Qırtlaq, dil, yumşaq damaq, dodaqların sinir tənzimi pozulur. Bu zaman nitq əzələlərinin hərəkətlərinin koordinasiyası pozulur.

Üçüncü səbəb - psixoloji problemlərdir. Belə adamlarda sayrışan qorxu hissləri olur. Onlar cəmiyyətdə çıxış etməyə qorxurlar, çox həyəcanlanır, utancaq olur, iradələri zəif olur.

Almaniyalı alimlər müəyyənləşdiriblər ki, kəkələmə beyinin sağ alın payındakı neyron hissəsinin hiperaktivliyi ilə əlaqədardır. Mütəxəssislərin sözlərinə görə, bu neyron şəbəkəsi artikulyar hərəkətlərin planlaşdırılmasına və realizə olunmasına mane olur. (fərziyyədir) [3, s.110].

Daha əvvəl aparılan tədqiqatlar göstərib ki, kəkələyən insanların beyin yarımkürələrində aktivlik balansı pozulmuş olur. Onların beyninin sol alın payındakı aktivlik aşağıdır, sağda isə yüksəkdir.

Uşağın prenatal (doğuşdan əvvəl) mərhələdə inkişafı, ananın uşağı doğarkən yaşı (35 yaş və ya yuxarı), onun əsəb-psixi sağlamlığı, ananın hamiləlik dövründə keçirdikləri xəstəliklər bilinməlsi vacib olan

məlumatlar arasındadır. Ata və ananın uşağın doğulmasına qədər sağlamlığı haqqında ümumi məlumatlar uşağın somatik və əsəb-psixi səviyyəsinin pozulma hallarını aşkarlamağa kömək edir. Bətndaxili inkişaf zamanı mənfi amillərin təsirinin öyrənilməsi uşağın nitq inkişafında dolayısı təsirini müəyyən etməyə şərait yaradır. Uşağın natal və postnatal inkişaf mərhələlərində müxtəlif mənfi amillərin olması, pozulmaların aşkarlanması kəkələmənin etilogiya və patogenezinin tam açıqlanmasına kömək edir.

Kəkələyən uşağın ilkin müayinəsi zamanı loqoped onda müşayiətedici nitq və hərəkət pozulmalarının olub-olmamasına diqqət yetirməlidir. Müşayiətedici nitq və hərəkət pozulmaları dedikdə kəkələyən uşaqların öz nitqlərində lazımsız səs və ya səslərin işlədilməsi və müxtəlif yardımçı, iradi və qeyri-iradi hərəkətlərin (danışarkən ayağını yerə bərk vurmaq, əl-qol atmaq, göz qırpmaq və s.) olması nəzərdə tutulur. [5.səh.74]

Məhz, bunun aydınlaşdırılması uşaqda aparılan nitq məşğələlərinin uğurlu olmasını müəyyənləşdirə bilər. Sərbəst nitqin səviyyəsinin araşdırılması, onun nitq müstəqilliyinin müxtəlif dərəcələrində kəkələmənin paroksizmlərinin özünü göstərməsindən asılı olaraq başlanır. Kəkələyən uşaqla dostları, valideynləri və maraqları olanlar söhbətlərdə onun nitq halları və nitq qıcolmalarının xüsusiyyətləri aşkara çıxarılır. Bunu müəyyən etmək üçün uşağa şəkil üzrə danışıq, hər hansı bir hadisə və ya oxunmuş mətn haqqında danışmaq tapşırılır. Sonra sadə və mürəkkəb ibarələri təkrar etmək və birgə tələffüz etmək yolu onda əksedilmə və ümumi nitqin vəziyyəti öyrənilir.

Kəkələməni uşaq yaşlarından reabilitasiya etmək lazımdır.Bunun üçün müxtəlif reabilitasiya metodları vardır, ancaq heç biri tam dəqiq zəmanət vermir. V.A.Qilyarovskiy, F.A.Rau, N.P.Tyapkin, M.Xvastev, N.A.Vlasova, S.S.Lyapidevskiy və başqaları özlərinin tədqiqatları və əməli fəaliyyətləri ilə kəkələməni aradan qaldırmaq üçün kompleks tibbi-pedaqoji yanaşma metodunun inkişafına kömək etmişdilər. [5.səh.77]

Kəkələmənin nə vaxt, necə, hansı şəraitdə baş verdiyini, kəkələmənin səbəblərinin araşdırılması, kəkələmə zamanı yaranan hərəkətlərin olub-olmaması, kəkələmənin nə vaxt daha da şiddətlənməsi və buna səbəb olan amillər öyrənilməlidir.

Kəkələməni xüsusiyyətlərinə görə belə qruplaşdırmaq olar: damaq kəkələməsi, nəfəs kəkələməsi, qıtlaq kəkələməsi, düşüncə kəkələməsi və s. Məsələn, uşaqda düşüncə kəkələməsi zamanı qəribə bir hal yaşanır. Belə ki, uşaq ailəsinin yanında olduqca çox kəkələyir. Mütəxəssis və ya kənar şəxslərin yanında olduqda isə bu kəkələmə hədsiz dərəcədə az olur. Yəni, bu artıq düşüncənin kəkələməni idarə etməsi deməkdir. Nəfəs kəkələməsi zamanı sanki uşaq boğulur, nəfəsini düzgün istifadə edə bilmir və kəkələyir. Sürətli kəkələmədə uşaq sürətli nitq formasında kəkələyir, bu vaxt 5 dəqiqəyə deyəcəyi sözü 2 və ya 1 dəqiqəyə söyləyir. Kəkələmənin sürəti, yəni o dərəcədə tez olur. Xüsusilə qeyd olunmalıdır ki, sürətli kəkələmə zamanı uşaqlar lazım olanı deyil, onu əvəz edə biləcək asan sözü deyirlər.

Müasir kompleks yanaşma dedikdə müxtəlif mütəxəssislərin səyi və kəkələyənlərin psixofiziki vəziyyətlərinin müxtəlif tərəflərinə ayrı-ayrı vasitələrlə loqopedik korreksiya pedaqoji təsir tədbirləri başa düşülür. Kəkələmənin reabilitasiya etmək üçün patogenetik və etioloji amilləri dəqiq araşdırmaq lazımdır.

## Ədəbiyyat

1. N.T.Hüseynova, T.H.Ağayeva. Loqopediya. Bakı: [ADPU], 2018.
2. Psikiatride güncel yaklaşımlar-Current Apporoaches in psychiatry 2011. Aslıhan Okan İbiloğlu, Kekemelik. 2011
3. Ю.А.Флоренская. Избранные работы по логопедии. Москва: АСТ, Астрель, 2007.
4. Zerner Z. Ieadind disabilites. Theories, diagnosis, and teaching strateges.
5. Z.M.Əzizova R.Q.Cəfərova Ş.N.İsmayılov «Loqopediyanın nəzəri əsasları haqqında ümumi məlumat», 2008

## The etiology and pathogenesis of stuttering

**Summary**

Stuttering is one of the current problems of our time. Stuttering usually occurs at an early age and during the transition to a state of crisis. As a speech pathology, stuttering is a sudden disruption of the articulatory apparatus that results from convulsions as a physiological whole. Stuttering needs to be rehabilitated from childhood.

## Этиология и патогенез призаикания

**Резюме**

Заикание - это одна из актуальных проблем в современное время. Заикание, в общем понятии, возникает в раннем возрасте, а также в критический период развития. Заикание, будучи паталогией речи, является в следствии физических судорог, приводящие к нарушение артикуляционного апарата. Явной причиной заикания точно не известно, в то же время многие факторы могут способствовать этому. Заикание необходимо реабилитировать в раннем возрасте.

**Rəyçi: dos. S.Aslanova**

Göndərilib: 05.05.2020 Qəbul edilib: 06.05.2020

**SƏNƏTŞÜNASLIQ ART CRITICISM ИСКУССТВОВЕДЕНИЕ**

DOI: 10.36719/AEM/2007-2020/53/205-208

**Səbinə Həbib qızı Abbaslı**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
sabinaabbas93@mail.ru

# XX ƏSR AZƏRBAYCAN BƏDİİ METAL SƏNƏTİNİN İNKİŞAFI

***Açar sözlər:*** *bədii metal, texnika, ənənəvi, dəmirçilik sənəti, misgərlik sənəti, zərgərlik sənəti*
***Key words:*** *art metal, technique, traditional, blacksmith, coppering, jewellery art*
***Ключевые слова:*** *художественный металл, техника, традиционное, железное ремесло, медничество, ювелирное искусство*

Hələ qədim zamanlardan bəri bədii metal sənəti Azərbaycan ərazisində ən çox inkişaf etmiş sənətlərdən biri idi. Azərbaycanda eneolit dövründə mis kəşf edildikdən sonra metal ibtidai icma cəmiyyətinin iqtisadi, təsərrüfat, ictimai və mədəni həyatında görkəmli rol oynamağa başlayır. Bu zaman başqa metallar da tapılıb müəyyənləşdirilir. Misal üçün, qurğuşun, qalay, marqanes metallarının kəşfi Azərbaycan tarixində yeni və mütərəqqi bir dövrün, tunc dövrünün başlanması ilə bağlıdır. Azərbaycan ərazisində qazıntılar zamanı tapılmış maddi-mədəniyyət nümunələri göstərir ki, əcdadlarımız hələ e.ə. II minillikdə tuncdan zərif formalı qablar, xəncərlər, baltalar, kəmərlər və s. zinət əşyaları düzəldib öz həyat və məişətlərində istifadə edirlərmiş. Bəşəriyyət tarixində "tunc dövrü" adlanan bu dövr Azərbaycana, 4 min il bundan əvvəl olduğuna baxmayaraq çox zəngin maddi mədəniyyət nümunələri vermişdir. Məhz buna görə də məşhur rus alimi, akademik İ.İ.Meşşaninov Azərbaycanın ərazisini zəngin və təbii muzey adlandırmışdır.

XX əsrdə Azərbaycanda bədii metal sənəti əsasən üç istiqamətdə inkişaf etmişdir. Bunlar dəmirçilik, misgərlik və zərgərlik sənəti idi.

Dəmirçilik, adından da məlum olduğu kimi, Daş dövründən sonra meydana gəlmiş bir sənətdir. Dəmirçi isə bu qədim el və xalq sənətini qoruyub bu günümüzə gətirib çatdıran, zindan üzərində, qolunun gücünə dəmiri "yoğuraraq" müxtəlif formalara salan, ən ağır əmək sərf edən sənət sahibidir. Onun əsas materialları dəmir, çuqun, mis, qalay və digər əlvan metallardır ki, respublikamız da bu təbii sərvətlərlə olduqca zəngindir.

Dəmirçilərin əmək alətləri də digər peşələrdə istifadə olunanlardan sadəliyinə görə fərqlənir: çəkiclər (böyük çəkic 2-16 kq, əl çəkicləri 0,5-2 kq ağırlığında), zindanlar (buynuzsuz, bir və ya ikibuynuzlu), kəlbətinlər, pazlar və s. Bunlardan öncə dəmirçinin əsas işini körük və daş kömürlə (son vaxtlar maye qazla) işləyən açıq soba görür. Onu da qeyd etməliyik ki, dəmirçilərin mexaniki çəkicləri (oynaq, qayış, buxar, pnevmatik və hidravlik) də olur. Bu çəkiclər son dövrlər istifadə olunan əmək alətləri sırasındadır.

Azərbaycanın bütün bölgələrində dəmirçilik peşəsi əsrlər boyu yaşadılıb və nəsillər dəyişdikcə ondan istifadə formaları da yeniləşib. Qarabağın zəngin dəmir filizi yataqları qədim zamanlardan başlayaraq yerli xammal əsasında dəmirçilik sənətinin meydana gəlməsində və inkişaf etdirilməsində mühüm rol oynayıb. Burada bəsit istehsal texnikasına əsaslanan filizəritmədə körüklü kürələrdən istifadə edilib. Proses belə olur: filiz parçaları kömürlə birlikdə kürənin odluğuna qoyulur. Qoşa körük vasitəsilə yaradılan yüksək temperatur filizi əridir. Kürənin odluğundakı qaynar metal kütləsindən ərinti zamanı əmələ gələn pas isə kəfkir vasitəsilə çıxarılır, təmizlənir. Əlbəttə, sırf dəmir əldə etmək üçün bu, kifayət etmir. Odur ki, dəmirçi ərintini saf dəmir halına gələnədək onu zindan üzərində döyür. Çəkic və zindanların əhəmiyyəti, ilk növbədə, burada üzə çıxır. Ona görə də əvvəllər yerli xammaldan hazırlanmış dəmir məmulatı davamlılığı və saflığına görə digər yerlərdən gətirilənlərdən fərqlənir və üstünlük təşkil edirdi.

XIX-XX yüzilliyin əvvəllərində Azərbaycanda dəmirçilik sənəti xüsusilə geniş yayılmışdır. Dəmirçilər əsas etibarilə kənd təsərrüfatı alətləri və məişətdə işlədilən əşyalar hazırlayırdılar. Məişətdə işlədilən alətlər sırf praktiki xarakter daşısa da, öz orijinal forması və bəzəkləri ilə diqqəti cəlb edir.

Hazırda bu dövrdə Gəncə, Şəki, Naxçıvan, Şuşa dəmirçiləri tərəfindən düzəldilmiş və muzeylərimizin bəzəyi sayılan bir çox məişət əşyaları: manqal, sacayağı, çapacaq, qapı dəstəyi, maşa və s. qalmışdır. Bu məmulatlar Azərbaycan dəmirçilərinin əl qabiliyyətindən xəbər verən qiymətli dəlillərdir. Bu dövrdə Azərbaycanda elə kəndlər var idi ki, oranın bütün əhalisi bu sənətlə məşğul olurdu. Buna Şamaxı yaxınlığındakı Dəmirçilər kəndi misal ola bilər.

Qədim xalq sənət növlərindən biri də Dəmir dövründən qalma misgərlikdir. Aparılan tədqiqatlar təsdiqləyir ki, Azərbaycanda misgərliyin yaradılması çox erkən dövrlərə təsadüf edir və ölkəmiz onun inkişaf edən mərkəzlərindən biri olub. Bu ərazilərdə tapılan ilk mis metal işləmələrin tarixi Neolit dövrünə aiddir. Miladdan əvvəl VI minillikdə mis əldə edildikdən sonra ondan müxtəlif əşyalar hazırlanıb.

Bir sənət kimi onun təşəkkülü artıq orta əsrlərdə böyük şəhərlərin misgərlik mərkəzinə çevrilməsinə gətirib çıxarıb. Azərbaycanda misgərliyin hələ erkən dövrlərdən yüksək inkişaf etdiyini bir sıra Avropa ölkələrində, o cümlədən Rusiya muzeylərində saxlanan mis eksponatlar da sübut edir.

Azərbaycanda bu əsrlərdə elə yerlər var idi ki, nəinki bir-iki küçə, hətta əhalinin əksəriyyəti misgərlik sənəti ilə məşğul olurdu. Belə mərkəzlərdən biri o vaxtlar Şamaxı xanlığına daxil olan Lahıc idi.

XIX əsrdən başlayaraq Lahıc misgərliyin əsas mərkəzinə çevrilib. Lahıc ustalarının misdən hazırladıqları, mürəkkəb və incə naxışlarla bəzədikləri dolça, satıl, sərnic, sərpuc, güyüm, teşt, məcməi, sini, dolça, aşsüzən, kəfkir, kasa, cam, qazan, çıraq və s. məmulatlar Orta Asiya, Dağıstan, Gürcüstan, İran, Türkiyə və digər yerlərdə tanınıb.

Ağqoyunlu hökmdarı Uzun Həsənin sarayında olmuş venesiyalı səyyah Kontarinin yazdığına görə, burada hər gün hökmdarın ətrafındakı təxminən 400 nəfərə mis qablarda yemək verilirmiş.

Təsərrüfat və məişətin müxtəlif sahələrində yaranan gündəlik tələbatları ödəyən misgərlik sənəti 40-dan artıq çeşiddə müxtəlif mis qab-qacağın, mərasim və məişət əşyasının yaranmasına səbəb olmuşdur. Bütün bu misgərlik əşyaları funksional təyinatına funksional təyinatına görə 4 qrupda təsnifatlandırılır. Bunlar maye qabları, mətbəx qabları və avadanlığı, süfrə qabları və avadanlığı, ev-məişət əşyaları.

Maye üçün istifadə olunan mis qablar arasında dolça, güyüm, aftafa, dolça, piyalə, parç, badya, lüləyin, hamam tası, tayqulp, çaydan, qəhvədan, abgərdən və digərlərinin adlarını çəkmək olar. Bu qabların coxusu zəngin nəbati naxışlar və kalliqrafik yazılarla bəzədilmişdir.

Ənənəvi mis qab-qacaq içində mətbəxdə istifadə olunan qabların da sayı az deyildi. Əsasən çörək və xörək bişirmək, müxtəlif ağartı məhsulları hazırlamaq, mürəbbələr və quru meyvələr hazırlamaq, ərzaq ehtiyatı saxlamaq üçün istifadə olunan bu qablar müxtəlif formaya və ölçüyə malik olmuşlar. Bununla yanaşı, müxtəlif təyinatlı mətbəx alətləri və avadanlığı da misgər ustalar tərəfindən böyük məharətlə hazırlanırdı.

Ənənəvi misgərlik məmulatları arasında süfrə qabları ayrıca qrup təşkil edir. Bu qablar istifadəsinə görə fərdi və kollektiv səciyyə daşıyırdı. Cam, kasa, nimçə, fincan, şərbəti, piyalə, masqura və digərləri fərdi süfrə qablarına aiddirlər.

Məcməyi, sini, sərpuş,ləngəri, dəhmərdan və sair, kollektiv istifadə üçün nəzərdə tutulmuş qablardır. Camlar böyük, orta və kiçik ölçülərdə olaraq, daxili səthi - saya, xarici isə - naxışlı olurdu. Camın orta ölçülü növü – kasa, kiçik ölçülü –piyalə və ya masqura adlanırdı.

Misgərlik kolleksiyasının böyük hissəsini ev-məişət əşyaları təşkil edir. Gündəlik və müxtəlif növ mərasim tələbatlarını ödəyən belə nümunələr interyerin tərkib hissəsi olaraq, o dövr insanlarının əşyalara olan praktiki münasibətini və dizayn təfəkkürünü əks etdirir. Eyni zamanda, bu əşyalar ənənəvi cəmiyyətdə yaşayan insanların estetik təsəvvürlərini, bədii normalarını və dəbi əks etdirmişlər.

Lahıcda bu əsrdə kulli miqdarda məişət əşyası və ev avadanlığı hazırlanırdı. Buradakı məhsullar həm keyfiyyət, həm də kəmiyyət baxımından o dövrün mərkəzi şəhərlərində hazırlanan məişət əşyalarından hec də geri qalmayıb. Hələ XIX əsrin ortalarında Lahıcda 190-a yaxın mis karxanası olub. XIX-XX əsrlərdə Rusiyadan ucuz qiymətə gətirilən qab-qacaq bu sənətə təsir etsə də, böyük tarixə malik olan misgərlik yenə metalişləmədə əsas yerlərdən birini tutub. Həmin dövrlərdə mis qablara hətta qonşu ölkələrdə də böyük ehtiyac duyulurdu. Təəssüf ki, əvvəlki dövrlərə nisbətən son illər mis məmulatlarının həm forması, həm də bəzək motivləri xeyli sadələşib. Artıq XX əsrin əvvəllərində bu məişət əşyalarının kəmiyyəti kimi, keyfiyyəti də getdikcə aşağı düşüb. Asan və ucuz başa gələn şüşə, saxsı, çuqun, dəmir qablar getdikcə mis məmulatlarını aradan çıxarmağa çalışır. Lakin bütün bunlara baxmayaraq, misgərlik əvvəlki gücünü saxlamasa da, bu qədim el sənətinin daşıyıcıları tərəfindən yaşadılır.

Metalişləmənin o biri növlərinə nisbətən zərgərlik sənəti bu əsrlərdə daha çox keçmiş dövrün mütərəqqi ənənələrinə sadiq qalmışdı. Əvvəlki dövrlərdə Azərbaycan qadınları tərəfindən sevilib gəzdirilən üzük, sırğa, bilərzik, sinəbənd, kəmər və s. yenə də dəbdə idi. Dəmirçilik və misgərliyə nisbətən bu sənət daha çox şəhərlərdə inkişaf etmişdi. Əvvəlki əsrlərdə olduğu kimi, bu əsrlərdə də zərgərlik mərkəzi Bakı, Gəncə, Şamaxı, Şəki və Şuşa idi.

Həmin illərdə zərgərlik sənətimizin inkişafına 1935-1936-cı illərdə Bakıda təşkil olunmuş zərgərlik fabriki böyük təkan verir. Buraya şəbəkəçi zərgərlər, həkkak və qəlibkarlar cəlb olundu. Fabrikin inkişafında xalq zərgərlərindən, ilk növbədə H.Quliyev, H.Haşımov və M.Səfərzadənin böyük rolu olmuşdur.

Beləliklə, sovet dövründə zərgərlik Azərbaycanda iki istiqamətdə - fabrik istehsalında və xalq zərgərlik yaradıcılığı yolu ilə artellərdə davam etdirilirdi. Həmin illərdə Bakı zərgərlik fabrikində Qərb üslubunda hazırlanmış nümunələr də modernizə edilirdi. Bu illərdə zərgərlik fabrikində məişətdə istifadəsinə ehtiyac duyulan zinət şeyləri (üzük, sırğa, bilərzik) daha çox istehsal olunurdu. Qərbin üzük modellərindən vaxtaşırı surətdə istifadə edilirdi. Fabrikdə milli zərgərlik nümunələrindən olan "paxlava" və ya "badamı" adlı "gül", "təkqaş" üzüklər, "badamı", "xəmraşı" sırğalar modernizə edilir, onların hər bir kiçicik hissəsi belə ovma, yonma əsasında sərrast surətdə biçilir, sonra da yonulmuş bu hissəciklər lehimlə birləşdirilirdi.

Həmin illərdə respublikamızın zərgərləri də öz yaradıcılıqlarında böyük müvəffəqiyyətlər əldə etmişdilər. Yeni materiallara müraciət edən Azərbaycanın zərgərlik incəsənəti bu illərdə özünün metal emalının ən qədim bədii üsullarını da saxlamış oldu. Əvvəllər olduğu kimi həmin illərdə Azərbaycanın zərgərlik incəsənətində əsas yeri şəbəkəçilik işi tuturdu. Xalq ustaları qızılın, gümüşün nazik simlərindən və melxiordan keçmişin ən yaxşı nümunələrindən heç də geri qalmayan mürəkkəb forma və bəzəkli sənət əsərləri hazırlayırdılar.

1960-cı illərdən başlayaraq bədii metalın zəngin növlərindən sayılan zərgərlik sənəti müxtəlif səbəblərlə əlaqədar olaraq, daha çox Şəki, Naxçıvan, Gəncə və Lənkəran şəhərinin ustaları tərəfindən inkişaf etdirilirdi.

Şəki zərgərləri Ə.Məmmədov, C.Əyyubov, Naxçıvan zərgərləri usta Mahmud və onun şagirdləri M.Seyidovun, A.Nəbiyevin, Ə.Əliyevin bu sənətin yerli ənənələr əsasında inkişaf etdirilməsində böyük rolları olmuşdur.

Məşhur azərbaycanlı zərgər, Azərbaycan Rəssamlar İttifaqının üzvü Cəmaləddin Eyyubovun əsərləri dəfələrlə beynəlxalq zərgərlik sərgilərində nümayiş etdirilmişdir. Ustadın bir çox əsərləri dünyanın bir çox ölkələrində dövlət və şəxsi kolleksiyalarda saxlanılır. Bu heç də təəccüblü deyil, çünki onun yaratdığı hər bir iş əsl zərgərlik əsəridir və ən təəccüblüsü də budur ki, Cəmaləddin Eyyubov bu sənəti özü öyrənmişdir, üstəlik, qohumları arasında da heç vaxt zərgər olmayıb.

Sənətkarın 1975-cü ildə yaratmış olduğu "Sevil" adlı boyunbağı onun yaradıcılığında ilk mühüm uğuru olmuşdur. Melxior, gümüş və minadan yaradılmış bu zərgərlik nümunəsi öz incəliyi ilə insanı valeh edir. 7 filiqran rozetkalar bir-biri ilə iki sıra zəncir vasitəsi ilə birləşdirilib. Rozetkaların hər biri onların alt hissəsinə bərkidilmiş damcıya bənzər asılqan ilə bəzədilib. Suyun rəmzi qismində çıxış edən damcı təmizliyi və paklığı simvolizə edir. Bununla yanaşı su həyat mənbəyidir. "7" rəqəmi Şərqdə müqəddəs olduğundan sənətkar öz əl işində məhz bu rəqəmə müraciət etmişdir. Rozetkaları bir-biri ilə birləşdirən zəncirlər birliyin dağılmazlığının təminatı və rəmzidir.

Boyunbağının arxa hissəsində qoşa zəncir bir zəncir ilə əvəz olunur, keçid yeri isə "ikili buta" ilə bərkidilib. Azərbaycan ornament ənənəsində butadan ibarət olan kompozisiyanın çoxsaylı növləri mövcuddur. "Sevil" adlı boyunbağıda zərgər "aşiq olmuş buta" növünə müraciət edir: iki damcı, iki qönçə bir-birinə doğru əyilir... Bu kompozisiya ənənəvi olaraq nəslin davamını simvolizə edir.

Metalda təcəssüm olunmuş xeyir-dua rəmzi kimi qəbul olunan bu incəsənət nümunəsini gənc zərgər nişan günündə öz yarına hədiyyə etmiş və bu səbəbdən onun adına uyğun olaraq adlandırmışdır. Bu zərgərlik nümunəsi öz sahibəsinin o qədər xoşuna gəlir ki, o bu boyunbağını toy günü də taxır.

Şəki sənətkarlarından başqa bu dövrdə digər bir çox sənətkarlar də öz əsərləri ilə insanı valeh edirdilər. Onların arasında Rəşid Məmmədov, Məhəmməd Şamov, Nina Paşayeva, Əli Əhmədov, Əlimuxtar Zeynalov kimi sənətkarların adını çəkmək yerinə düşər.

XX əsr Azərbaycan şəbəkə ustaları arasında zərgərlik sənətində nadir hal hesab olunan qadın sənətkar Nina Paşayevanın yaradıcılığı xüsusi diqqətəlayiqdir. Onun işləri müxtəlif zinət əşyaları və xüsusilə də işıq və kölgə arasındakı qarşılıqlı əlaqəni yüksək sənətkarlıqla ifadə etməsi ilə səciyyələnir. Azərbaycan Xalça Muzeyində saxlanılan zərgər Nina Paşayevanın 1976-cı ildə metaldan düzəldilmiş "Piyaləzəng" sırğaları şəbəkə və gavərsə texnikasında düzəldilib. Sırğaların kompozisiyası bir-birinin üstündə yerləşdirilən gül rozetkası, zınqırov və ya çevrilmiş piyalə şəklində olan iki elementdən ibarətdir.

**Ədəbiyyat**

1. Rasim Əfəndi. "Azərbaycan incəsənəti". Bakı. "Şərq-Qərb". 2007
2. Məhəmməd Nərimanoğlu. "Qol gücü, zindan və alın təri. El sənəti: dəmirçilik". Azərbaycan. 2011. - 4 sentyabr. - S. 5
3. Məhəmməd Nərimanoğlu. "Azərbaycanda misgərliyin tarixi beş əsrə bərabərdir". Azərbaycan. 2014. - 18 dekabr. - S.11
4. Telman İbrahimov. "Bədii metal". Azərbaycan Xalça Muzeyi. Bakı. 2017
5. Sevil Sadıxova. "Azərbaycan zərgərlik sənəti". Mədəni-maarif. 2010. - №1/2. – S.66-70.
6. Sevil Sadıxova. "Zərgərlik". Azərbaycan Xalça Muzeyi. Bakı. 2017

7. Наиля Баннаева. “Благословение, воплощенное в металле”. Kaspi. 2018

**The development of the Azerbaijani metal art in the twentieth century**
**Summary**

Azerbaijan folk art has very ancient and rich traditions. Copper, after its discovery in Azerbaijan in the period of eneolit plays an important role in the economic, agricultural, social and cultural life of the people of. In the XX century, 3 kinds of metal art were developing in Azerbaijan. They were the profession blacksmith, coppering and jeweller's art.

**Развитие Азербайджанского ремесла по металлу в XX веке**
**Резюме**

Азербайджанское народное ремесло имеет глубокие и богатые традиции. После открытия в Азербайджане в период энеолита меди, металл начал играть важную роль в экономической, хозяйственной, общественной, культурной первобытнообщинной жизни. В XX веке в Азербайджане в ремесле по металлу в основном развивалось по трем видам: железному, медному и ювелирному делам.

**Rəyçi: dos.S.Sadıqov**

Göndərilib: 14.04.2020 Qəbul edilib: 17.04.2020

DOI: 10.36719/AEM/2007-2020/53/209-211

**Aytac Rauf qızı Teyyubova**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
teyyubovaytac@gmail.com

# "ŞUŞA"-nın TARİXİ-MEMARLIQ ABİDƏLƏRİ ELTURAN AVALOVUN QRAFİK SİLSİLƏSİNDƏ

***Açar sözlər:*** *Şuşa, abidə, qrafika, memarlıq, lövhə, ağ-qara cizgilər*
***Key words:*** *Shusha, monument, graphics, architecture, picture, black and white drawings*
***Ключевые слова:*** *Шуша, памятник, графика, архитектура, рисунок, черно-белые рисунки*

İntiqam hissiylə coşurdu Şuşa,
Bu döyüş deyildi, adi tamaşa.
Düşmənin qurduğu hiylə torunda,
Son dəfə canını tapşırdı Şuşa.
(Səməd Vurğun)

Şuşa Azərbaycan xalqı üçün həmişə qürur mənbəyi hesab olunan mövzu olmuşdur və bu təsviri incəsənətimizdə də özünü aydın bir şəkildə göstərir. Bu da səbəbsiz deyil. Azərbaycanın unikal mədəniyyət mərkəzlərdən biri olan Şuşa Dağlıq Qarabağ Muxtar vilayətinin ən səfalı bölgələrindən biridir. Şəhərin əsası Pənahəli xan tərəfindən qoyulduğuna görə də ilk vaxtlarda "Pənahabad" adlandırılırdı. Şuşa qalası 3 əsas qapıya malik idi: Ağoğlan, Gəncə, İrəvan qapıları. Qarabağın incisi sayılan Şuşa öz tarixi memarlığı ilə məhşur olan şəhərdir. Burada 549 qədimi bina, 17 məscid, 2 qəsr, 2 mədərsə,72 mühüm tarixi abidə və tanınmış şəxslərin evləri mövcuddur. Bu bölgədə yerləşən bir çox tarixi memarlıq abidələri memar Kərbalayi Səfixan Qarabaği tərəfindən inşa edilmişdir. Azərbaycanın Qarabağ bölgəsinin Erməni silahlı birləşmələri tərəfindən ələ keçirilmiş torpaqlarında vandalizmin izlərini aydın bir şəkildə görmək mümkündür. Bunun ən başlıca nümunəsi isə memarlıq abidələrimiz hesab olunur ki, Ermənilər Azərbaycana məxsus olan bir çox abidələrin məhv edilməsini ilə yanaşı təəssüf ki, bəzilərinin də ermənləşdirilməsinə nail olmuşlar. Bu mənada Şuşa ünvanlı sənət əsərləri duyulası tarixi əhəmiyyət daşıyır. Çünki, zamanında malik olduqlarımızın gələcək nəsillərə çatdırılması üçün tarixi abidələrimizin bədiiləşdirilməsi ən yaxşı vasitədir.

Bu mənada bir çox sənətkarların, rəssamların yaradıcılığında Şuşanın əsas mövzu hesab edilməsi yaxşı haldır və bu sırada Elturan Avalovun adı xüsusi hörmətlə çəkilir. Qarabağ mövzusuna müraciət edən sənətkarların öncüllərindən olan rəssam Elturan Avalov yaradıcılığı incəsənətimizdə mühüm yer tutur. "Şuşa" rəssamın bədii irsini daha da zənginləşdirən mövzulardandır. Anası Məhbubə xanımın əslən Şuşalı olmasının rəssamın bu mövzuya müraciət etməsində az təsiri olmamışdır.

Elturan Avalov incəsənətin bir çox sahələrində fəaliyyət göstərmiş, lakin rəssamlığın qrafika janrında daha davamlı və məhsuldar işləmişdir. Buna səbəb isə uşaq vaxtından evlərində olan "Molla Nəsrəddin" jurnalında gördüyü qrafik cizgilər və karikaturalar olmuşdur. E.Avalov Azərbaycan Politexnik İnistutunun inşaat fakultəsinin memarlıq şöbəsini bitirmiş, daha sonra isə AMEA Memarlıq və İncəsənət İnstitunda təhsilini davam etdirmişdir. Akademik Əbdülvahab Salamzadə rəhbərliyi ilə rəssam Şuşa memarlığı ilə bağlı elmi işini müdafiə etmişdir. Rəssam 1968-1970–ci illər ərzində Şuşada olmuş və elmi işi ilə bağlı olaraq axtarışlar ertmişdir. O, Şuşa ilə bağlı demək olar ki, hər bir nüansı öyrənirdi. Sənətkar bir- birinin ardınca "Memarın gözü ilə", "Şuşa memarlığı", "Elturan" kitablarını dərc etdirmişdir. Rəssam Şuşa memarlığına həsr olunmuş lövhələri ağ- qara tonlarla, tuj pero texnikasına işləmiş, ərsəyə gətirmişdir.

E.Avalov yaradıcılığının ana xəttini də məhz Şuşa mövzusu təşkil edir. Şuşa şəhərinin memarlığını tədqiq edən sənətkar, şəhərin müasir memarlığı ilə yanaşı, gördüyü əski memarlıq abidələrini də təsvir etmişdir. O, şəhərin bütün küçələrini bir - bir gəzərək tarixilik daşıyıcılarımız olan memarlıq abidələrimiz ilə tanış olmuş, onları hiss etmiş, duymuşdur. Elturan Avalovun Şuşa ilə bağlı rəsimləri sayəsində məhz bizlər də dağıdılmış, taleyindən bixəbər olduğumuz abidələrimiz, meydanlar, bulaqlar haqqında müəyyən məlumat əldə edə bilirik.

Rəssamın yaradıcılığında Şuşanın tarix memarlığından "Xan qızı Xurşidbanu Natəvanın evi", "Yuxarı Gövhər ağa məscidi", "Mehmandarovların evi", "İbrahimxəlixanın qəsri", "Bəstəkar Üzeyir Hacıbəyovun evi", "Aşağı Gövhər ağa məscidi", "Turşsu qaleryası", "Xan sarayı", "Saatlı məscidi", "Qala qüllələri",

"Xurşudbanu Natəvanın tikdirdiyi karvansara", "Qara böyük Xanım darvazası", "Gəncə darvazası", "Pənahəli xanın qəsri", "M.P.Vaqif məqbərəsi və digər abidələr öz əksini tapmışdır.

Elturan Avalov yaradıcılığında eyni memarlıq abidəsinə bir neçə dəfə müraciət edərək onları hər dəfəsində tamaşaçıya fərqli rakuslardan təsvir etməklə, onun gözəlliyini üzə çıxarmağı bacarmışdır. "Yuxarı Gövhər ağa" mövzusuna da rəsssam iki dəfə müraciət edərək abidənin bütün detallarını dəqiqliklə əsərində əks etdirmişdir. Memarlıq abidəsi 1883-1884-cü illər ərzində Kərbəlayı Səfixan tərəfindən Gövhərxan ağanın sifarişi əsasında tikilmişdir. Təsvirdə ilk öncə bütün incəlikləri, əzəməti ilə ucalan memarlıq nümunəsi diqqət çəkir ki, ön hissədə yerləşdirilmiş olan Meydan bulağı isə abidə ilə bir bütünlük əldə etmişdir.

Avalov yaradıcılığına xas olan sakitlik duymunu bu təsvirdə də ayın bir şəkildə görmək mümkündür. Göy üzündə başlayan fırtınaya yer də biganə qalmamış, ona qoşulmuşdur. Rəssam bu effekti ağ – qara cizgilərlə dalğavarilik yaratmaqla əldə etmişdir. Bu fırtınaya məhəl qoymayan memarlıq abidəsi isə öz statikliyi, sakitlik duyumu ilə seçilir. Rəssamı da öz həmkarlarından fərqləndirən bu başlıca xüsusiyyəti təsvirdə aydın görünür. Bu tarixi abidənin bütün memarlıq xüsusiyyətləri, incəlikləri rəssam tərəfindən işlənilmişdir.

"Onun "şəhər-qala"nın memarlıq incilərinə yaradıcı memar – rəssam münasibətindən Şuşanın cəlbediciliyi və ecazkarlığı ilk baxışdan duyulan "memarlıq salnaməsi"yaranmışdır. Çox vaxt sənətkarlarımızın zamanında yaşadıqları dövrə "bədii güzgü" tutmaqda gecikmələrinin qarşılığında Elturan Avalovun ağ –qara cizgilərdən "boylanan" əsərlərini həm də onun yaradıcı –vətəndaş mövqeyinin nümayişi saymaq olar. Rəssamın Şuşa ünvanlı lövhələrində tarixiliklə bədiiliyin uğurlu sintezinin mövcudluğu yəqin ki silsilənin əhəmiyyətini artıran amillərdəndir. Hər bir motivi qeyri – adiliyi ilə seçilən cizgi improvizələri ilə gerçəkləşdirən rəssam müxtəlif formalı cizgilərlə sözün əsl mənasında "daşlaşmış poetika" kimi qəbul olunan milli memarlıq tikililərinə duyğulandırıcı estetik tutum bəxş etmişdir.

Rəssamın yüksək sənətkarlıq metodu ilə yaratmış olduğu digər eyniadlı əsəri isə "Aşağı Gövhər ağa" hesab olunur. Məscid Şuşanın qapan meydanında Gövhər ağanın sifarişi ilə 1874 -1875–ci illərdə tikilmişdir. Tabloda məscidin bütün təsviri deyil, yalnızca giriş hissəsinin təsviri verilibdir ki, rəssam memarlığın giriş hissəsini, tağını, pəncərələrinin əyintili formasını - bütün memarlığını dəqiq bir şəkildə göstərə bilmişdir. Bu da Elturan Avalovun yaradıclığının, onun məharətinin göstəricisidir. Ağ-qara cizgilərlə işlənilmiş tağlar öz möhtəşəmliyi ilə seçilir.

Yaradıcılığındakı "Xan sarayı", "Saatlı məscidi", "Xurşudbanu Natəvanın evi","Xan qızı bulağı", "Mehmandarovların evi", "Zöhrabbəyovların evi", "Xan evi", "Bəstəkar Üzeyir Hacıbəylinin evi", "Çuxur məhəllə", "Mamyı məhəlləsi", "Bülbülün evi", "Süleyman Ələsgərovun evi", "Seyidli məhəlləsi", "Ağdədəli məhəlləsi", "Nəcəf bəy Vəzirov küçəsində Məşədi Tağıyevin evi", "Seyidli məhəlləsində xanəndə Cabbar Qaryağdıoğlunun evi" və b. qədimiliyi özündə yaşadan abidələrdəndir.

Rəssamın ən yaddaqlan rəsimlərindən olan "Gəncə darvazası" əsəri tuş- pero texnikasında işlənilmiş və öz axıcılığı ilə seçilir. Rəssam darvazanı mərkəzdə yerləşdirməklə, ətrafında isə heç bir detal əlavə etmədən tamaşaçının diqqətini məhz Gəncə qapısına yönəltmişdir. İlk baxışda darvazanın ön hissəsində sanki axan çayın təsviri verilmişdir. Lakin bu rəssamın yaradıcılığına xas olan axıcılıqdan irəli gəlir. Sözün əsl mənasında bu abidə Şuşanın ən çox seçilən abidələrindəndir. E.Avalov da məhz bu abidəni təsvir etməklə də bu memarlığın vacibliyini bütün detallarında vurğulamışdır.

Elturan Avalovun təsvirlərindəki ağ və qara rəngin koloriti rəsmlərinin füsunkarlığını əldə edilməsinə gətirib çıxarır. Rəssam yüksək sənətkarlıq metodu ilə yaratmış olduğu qrafik cizgilərdə qədim şəhərin bədii salnaməsini təşkil edən memarlıq abidələri bütünlükdə öz arxitekturası, dekorativlikləri, xırda detalları ilə birgə təsvir edilmişdir. Şuşa ilə bağlı rəsmlərdə sənətkar memarlıq abidələrimizin keçmiş görkəmini yüksək məharətlə təsvir etmişdir.

Rəssamın bədii irsində "Xan qızı" Xurşidbanu Natəvanın adını daşıyan bulağın təsvirinə də yer ayrılmışdır. Qarabağın sonuncu hakimi Mehdiqulu xan Cavanşirin qızı Xurşidabanu Natəvan lirik üslubda çalışan şairə, rəssam həm də xeyirxahlığı ilə də ad qazanmışdır .Xan qızı Qarabağın bütün kimsəsizlərinə kasıblarına əl tutmuş, onlara həmişə köməklik etmişdir. O Şuşaya su çəkdirmiş, elə buna görə də bulağın adı "Xan qızı bulağı" adlandırılmışdır. Memarlıq abidəsi Şərq üslubundakı detalları ilə diqqət çəkir. Rəssamın yaradıcılığında özünəməxsusluğu ilə seçilən bu əsərdə Xan qızı bulağı ön planda yerləşdirilərək, bütün detalları ilə birgə işlənilmişdir. Ətrafında yerləşdirilmiş ağaclar isə monumentallığı ilə seçilir.

Elturan Avalov hal-hazırda Azərbyacan Memarlıq və İnşaat Universitetinin "Təsviri incəsənə" kafedrasının müdiri vəzifəsində çalışır. Sənətkarın Şuşa ilə bağlı 50-dən çox əsərə malik olduğu da bir faktdır. Ancaq rəssam bu gün də bir-birinin ardınca bədii irsini zənginləşdirən Şuşa mövulu əsərlər yaratmaqdadır.



**Elturan Avalov "Yuxarı Gövhər ağa məscidi"- tuj- pero, 1990 -2000-ci illər.**

**Ədəbiyyat**

1. "Şuşamızın memarlıq səlnaməsi/Bir əsərin tarixçəsi", Ziyadxan Əliyev - Mədəniyyət, 2017, 5 may, S. 13.
2. Shusha (İsomatrial) - E.Avalov, Heydar Aliyev Foundation - Bakı, 2008.
3. "Memarlıq abidələri təsviri sənət əsərlərində" - sərgi, Gülər - Mədəniyyət, 2011, 30 sentyabr, S.13.
4. "Mənə Vətənimin qoxusu daha əzizdir" - Elturan Avalov - Zaman, 2011, 12 - 18 mart, S. 7.
5. "Elturan Avalov qrafik əsərlərində Şuşanın bədii-estetik təcəssümü", Gülnar Dadaşlı - Mədəniyyət. N 2. S. 64-66
6. Memarın gözü ilə, Elturan Avalov - Bakı, 1978.
7. "Memar rəsm çəkməyi bacarmırsa onun memarlığı bütöv olmayacaq - Vaxilə arşımalçı kimi Şuşanın bütün küçələrini həyətlərini gəzib rəsmlər çəkmişəm", E.Avalov, müsahibəni apardı S.Soltanlı - Mədəniyyət, 2015. 24 iyul, S.8.

**Historical and architectural monuments of "Shusha" in the Elturan Avalov graphic series**

**Summary**

"Shusha", which holds an important place in the works of artist-architect Eltuan Avalov, is in a series of works that occupy an important place in our fine arts. In these paintings, the artist depicts the architectural works of Shusha as a memory of his childhood and later as a result of his research. This article provides an analysis of Elturan Avalov's works included in the "Shusha" graphic series.

**Историко-архитектурные памятники "Шуша" в графической серии Элтурана Авалова**

**Резюме**

«Шуша», занимающая важное место в творчестве художника-архитектора Эльтуана Авалова, входит в серию работ, занимающих важное место в нашем изобразительном искусстве. На этих картинах художник изображает архитектурные произведения Шуши как память о своем детстве, а затем и в результате своих исследований. В данной статье приводится анализ работ Эльтурана Авалова, включенных в графическую серию «Шуша».

**Rəyçi: prof. Z.Əliyev**

Göndərilib: 04.04.2020 Qəbul edilib: 07.04.2020

DOI: 10.36719/AEM/2007-2020/53/212-215

**Fidan Nazim qızı Məmmədova**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
Fine.art21@mail.ru

# XX ƏSRIN 50-CI İLLƏRİNDƏ AZƏRBAYCAN RƏNGKARLIĞINDA TƏSVİRİ SƏNƏTƏ QOVUŞMUŞ QADIN OBRAZLARIN XÜSUSİYYƏTLƏRİ

***Açar sözləri:*** *qadın obrazı, portret, M.Abdullayev, T.Tağıyev, B.Mirzəzadə*
***Key words:*** *female image, portreit,M.Abdullayev, T.Tagiyev, B.Mirzazadeh*
***Ключевые слова:*** *образ женщины, портрет, М.Абдуллаев, Т.Тагиев, Б.Мирзезаде*

Əgər tarixə qovuşmuş Azərbaycan incəsənət tarixinə nəzər yetirsək, o zaman qadın gözəlliyinin və incəliyinin tərənnümünün təsviri sənətdə, o cümlədən də rəngkarlığda mühüm yer tutduğunu görərik. Əgər keçmişimizi vərəqləməli olsaq, o zaman Azərbaycan tarixində çoxsaylı qəhrəman, cəsur və ziyalı qadınlarımızın olduğunu görərik.

Müharibədən sonrakı dövrdə Azərbaycan rəngkarlığının fərqləndirici xüsusiyyəti müasirliye nüfüs edilməsindən, janrların geniş inkişafından ibarətdir. Rəngkarlığda ön planda sosrealizm özünü biruzə verir. Rəssamlar əmək fədakarlığını, başdan-başa dəyişmiş vətən torpagının gözəlliyini tərənnüm edən, bir sıra qadınların obrazını kətan üzərində canlandırmışlar. Bu dövrdə məharətlə çalışan rəssamlardan M.Abdullayev, B.Mirzəzadə, T.Tağıyev və b. öz dəsti-xətti ilə seçilən və başqa sahələrdə öz sözünü demiş və özünəməxsus sənət yolu seçmiş qadınların obrazını əsərlərində canlandırmışdırlar.

Azərbaycan müasir təsviri sənət tarixində elə şəxslər olub ki, onlar hansı dövrdə, hansi şəraitdə yaşamasından asılı olmayaraq, sənət ideallarını daha uzaq zamanlara hesablayaraq yaradıblar. Çünki onlar yaratdığlarının zamanın dönəmi dəyişdikcə, öz əhəmiyyətini daha da artıra və düşündürə biləcəyinə əmin olublar.

Beləliklə, təsviri sənətin rəngkarlıq sahəsində çalışan rəssamlarımız daima öz yaradıcıqlarında qadın obrazına müraciət etmişlər. Tanışlıq üçün deyək ki, bu qəbilədən biri xalq rəssamı Tağı Tağıyevin XX əsrin 50-80-ci illərində yaratdığı qadın obrazları öz lirizm və incəliyi ilə, gözəllik və sadəliyi ilə, daxili, mənəvi zənginliyi və orijinallığı ilə və gözoxşayan rəng harmoniyası ilə diqqət mərkəzində durur. Onun əsas müəllimləri təbiət və insanlar olmuşdur. Rəssamın müraciət etdiyi qadın obrazları zəhmətkeş insanların, ziyalı, mədəni və gələcəyi parlaq olan gənc qadınların obrazları ilə diqqət mərkəzində durur. Ümumiyyətlə rəssam Tağı Tağıyev portret əsərlərində təsvir edəcəyi şəxsin, obrazın daxili aləmi, ruhi vəziyyətinə maraq göstərir və özünəməxsus xüsusiyyətlərini ön plana çəkməyə önəm vermişdir. Rəssamın bu qebilədən olan "Həyat yoldaşının portreti" (1950), "İmtahandan qabaq" (1955), "Əsmər qız"(1957), "Rəssam Maral Rəhmanzadənin portreti"(1960) və s. əsərlərin göstərmək olar. Sənətkar həyat yoldaşı Həbibə xanımın çoxsaylı portretlərini çəkmişdir. Bu məqamda bu obraz təbiiliyi ilə diqqəti cəlb edir. "İmtahandan qabaq" olan əsərdə zərif, bir o qədərdə zəhmətkeş qadın obrazı təsvir olunmuşdu. Rəssam obrazın üz cizgisinin dəqiq verilməsi ilə, obrazın daxili aləmini, hiss və duyğularını aydın ifadə etmişdir. Onun simasından bilmək olar ki, məharətlə çalışıb imtahana hazır gəlib. Sanki o anda öz növbəsini gözləyərkən gözləri uzaqlara dalmış yorğun baxışlarını rəssam çox gözəl əks etdirə bilmişdir.



1961-ci ildə T.Tağıyev Qərbi Afrika ölkələrinə yaradıcılıq axtarışlarına gedir. Bu səfərdən aldığı təəsüratlar rəssamın yaradıcılığına güclü təsir göstərir. Bunula belə, Afrika qadınlarından bəhs edən lirik və eyni zamanda çox dekorativ kompozisiyalarda sənətkar təbii gözəllikəri ifadə etməyə cəhd edir. Rəssamın Afrika silsiləsinə aid olan "Afrika qızı" əsəri mühüm əhəmiyyətə malikdir. Beləliklə, bizim qarşımızda al şəfəqə qərq olan, güclü iradəyə və bədən quruluşuna malik, gözəl gənc afrikalı qadın canlanır. Bu səfərdən sonrakı illərdə yaranmış "Ana səadəti" (1961), "Baradügahdan olan qadın" (1964-1965) əsərlərlərini qeyd etmək olar.



Azərbaycan təsviri sənətinin görkəmli nümayəndəsi Mikayıl Abdullayev əlinə fırça aldığı gündən könlünü rənglər aləminə əbədi məhəbbətlə bağladı. Gözlərinin seçdiyi, əllərinin isitdiyi mövzuları kətan üzərində elə ustalıqla işlədi ki, istedadlı rəssam üçün quruluş, zaman anlayışı olmadı. Əslində, yaradıcılığının qızıl dövrü sovet hakimiyyətinin hökm sürdüyü illərə təsadüf etdi. Amma elə əsərlər yaratdı ki, diktələrə boyun əymədi, vaxtdan yuxarıda dayandı. Fırçasından süzülən sənət inciləri əbədiyaşarlıq qazandı. Rənglər Mikayılın əlində sanki sehrlənirdi. Xalq rəssamı Mikayıl Abdullayev da 1950-ci illərdə yaradıcılığında qadın obrazlarına geniş yer vermişdir. Qadın gözəlliyini, zərifliyini və cəmiyyətdə tutduğu mövqeydən aslı olaraq yanaşdığı qadın obrazları rəssamın əsərlərinin aparıcı rolunu təmsil edir. Sənətkar əsərlərinin əsas qəhramanları kimi qeyri-adi məlahəti və təmkini ilə fərqlənən qadınları təsvir edirdi. Rəssamın vurğuladığına görə, o, əsrin dörddə birini qadın surətləri üzərində işə həsr etmişdi və rəssamın ilham verici bağlılığın əsasını, ilk növbədə, mənəvi və plastik gözəllik təşkil edir. Sənətkar kənd qızları, kənd qadınları olan qəhrəmanlarının hər hərəkətini diqqətlə izləyirdi. Bu bədii xüsusiyyətləri özündə əks etdirən əsərlər silsiləsindən sənətkarın "Sosialist Əməyi qəhrəmanı Şamama Həsənovanın portreti", "Mənim anam", "Güzgünün qabağında", "Caypur qadınları" və s. qadınlara ithaf olunmuş əsərləri qeyd etmək olar.

Rəssamın portretləri arasında yer tutan portretlərdən biri də "Rəqqasə Əminə Dilbazinin portreti"dir. Milli geyimdə zərif əlləri ilə rəqs edən rəqqasənin obrazı tünd rəngli fonda təşkil edir. Onun geyimində təsvir olunan bəzəklərin, ornamentlərin dəqiqliyi və obrazın zərifliyi ilə səciyyələnir, bundan başqa təsviri əsərə dinamiklik bəxş edir. Bundan əlavə rəssam çox dərin məhəbbətlə sevdiyi anasını təsvir etmişdir. Buna misal "Mənim anam" ("Rəssamın anasının portreti") adlı əsərini vurğulamaq zəruridir. Kompozisiyanın əsasını qayğıkeş, mehriban qadın, ana obrazının təsviri təşkil edir. Öz dəsti-xətti ilə seçilən sənətkar həyat yoldaşı Leyla xanımın portretinə yaradıcılığında dəfələrlə müraciət etmişdir. "Güzgünün qabağında" olan əsərində həyat yoldaşını ketan uzərində görüntüyə gətirmişdir.



Mikayıl Abdullayev öz qəhrəmanlarının portretlərində incə psixoloji çalarları göstərməyə qadir idi. Sənətkar ifadəli simalar təsvir etməklə yanaşı məna kəsb edən duruşu göstərmək üçün mürəkkəb rakurslardan məharətlə istifadə edirdi. Buna misal olaraq, sosialist əməyi qəhrəmanı "Şamama Həsənovanın portreti"ni qeyd etmək zəruridir. Portretdə elin qəhrəman qızı tarlada təsvir olunub. Axşam günəşinin parlaq şuaları onun üzünü işıqlandırır. Rəssam pambıq ustasının dərin psixoloji sürətini yaradır. Əmək qəhrəmanının xoşxasiyyətli, nikbin xarakterli, humanist duyğulu, gözəl bir insan olduğunu bizə çatdırır.

Rəssamın üçaylıq Hindistan səfərləri (1957) baxışlarında dəyişiklik yaratdı və o, 1950-ci illərin sonlarında rus realizminin stilistikasından tamamilə uzaqlaşdı. Sənətkarın palitrası ahəngdar, boyaları gərgin xüsusiyyəti alır. Hindistan ölkə sakinlərinin mehriban anaların, biçarə dilənçilərin, zəhmətkeş kəndlilərin cazibəli gözəlliyi ilə özünə cəlb edən qadınların psixologiyasını dərk etməyə can atır və bununla belə hind qadınların gözəlliyinə, plastikasına, zərifliyinə heyran qalan sənətkar zəngin qadın sürətləri qalereyası yaradır. Müəllifi olduğu "Caypur qadınları" adlı əsərdə rəssam hind qadının obrazını olduqca dəqiq və ifadəli təsvir etməyə nail olmuşdur. Burada sənətkar hind qadınların geyim mədəniyyəti haqqında təsəvvür formalaşdırmağı bacarmışdı. Bundan əlavə Hindistan silsiləsindən olan "Racəstanlı qadın" (1957), "Çəltikçi qızlar", "Benqal qızlar", "Balaca Çandra", "Körpəsinə süd verən qadın" - ən uğurlu əsərləri kimi hesab etmək olar. Sariyə bürünmüş gözəllərin incə, cazibəli yüngül yerişinə, parlaq geyim və bəzəkləri ilə ziddiyyət təşkil edən qarayanız dərisinə, incə barmağlarına, və zərif biləklərinə, hərəkətlərinin təbiiliyi və sərbəstliyinə valeh olmamaq mümkün deyil.

Xüsusi vurğulamaq lazımdır ki, yalnız müharibədən sonrakı illərdə T.Tağıyev, M.Abdullayev kimi rəssamlarımız bir sıra psixoloji portretlər çəkərək milli portret janrında yeni mərhələnin başlanmasına təkan vermişlər. Böyükağa Mirzəzadənin portret janrında qadın obrazlarını işlənmiş əsərlərində də bu yeniliklər hiss olunur. Bu portret qadın obrazlarından “Müğənni S.Qədimova” (1956), “Balerina R.Axundova” (1956), “Müğənni S.Aslanova” (1957), “Rəqqasə R.Cəlilova” (1957) və bir çox digər portretlər bu qəbildəndir.

Qeyd etmək lazımdır ki, müasir Azərbaycan təsviri sənətinin görkəmli nümayəndəsi, xalq rəssamı Böyükağa Mirzəzadə sənətinin qüdrəti ilə ölkəmizin sərhədlərindən uzaqlarda da şöhrət qazanmış, yaratdığı əsərlərlə Azərbaycan təsviri sənət tarixinə öz adını əbədi həkk etmişdir.

XX yüzillikdə Azərbaycan incəsənəti milli bədii irsin zəngin qaynaqlarından, eləcə də dünya mədəniyyətinin mütərəqqi ənənələrindən və novator nailiyyətlərindən faydalanma yolu ilə yüksək inkişaf mərhələsinə çatmışdır. Mübaliğəsiz qeyd etmək olar ki, həmin dövrün olduqca gərgin, mürəkkəb, dinamik siyasi və ictimai şəraitində formalaşıb boya-başa çatmış milli incəsənətimizdə özünəməxsus tərəqqi və intibah baş vermişdir. Bunun başlıca səbəbi xalqın həyatında, cəmiyyətdə, mənəvi mədəniyyətin müxtəlif sahələrində gözəçarpan yeni təmayüllərin, yeni estetik tələblərin yaranması ilə bağlı olmuşdur.

XX əsrin 50-ci illərində Böyükağa Mirzəzadə yaradıcılığının zənginləşdiyi bir mərhələdir. Bütün fəaliyyəti boyu mövzu rəngarəngliyi ilə seçilən Böyükağa Mirzəzadənin (1921-2008) əsərlərində də onun dünya incəsənəti ənənələrindən yaradıcılıqla faydalandığı duyulmaqdadır. O, müxtəlif mövzu və obrazlara müraciət etmişdir. Tematik janrda yaratdığı qəhrəman obrazları zamanın ideoloji tələblərinə uyğun olaraq zəhmətkeş insanlar, fəhlə və kolxozçular idi. Sənətkarın özünəməxsus ton keçidləri, plenerə hədsiz marağı olması, impressionist ənənələrinə xüsusi meyilliyi, işiq-kölgə effektlərinin səlisliyi və rəsmin dəqiqliyi ilə, rəsmlərindəki işiqli, günəşli mühitdə olması sosializm ideologiyasına görə heç də quru görüntüdən ibarət deyil. Bu xüsusiyyətlərdən bir nəticə çıxararaq rəssamın “Pambıq yığımı” olan əsərində özünəməxsus işləmə tərzinin necə məharətlə təsvir etməsinin şahidi ola bilərik. Komozisiyanın əsasını zəhmətkeş qadınların iş prosesi zamanı təsviri təşkil edir. Qırmızı, narıncı, ağ ton keçidlərinin və səmanı təmsil edən mavi rəng tonunun dəqiq seçimi əsərin təsir gücünü artırır. Bu əsərdə təsvir olunan obrazlar sanki, ani zaman kəsiyində yaranmışdır.

B.Mirzəzadə yaradıcılığında portret janrı mövzu nöqtəyi-nəzərindən çoxluq təşkil edir. Rəssam yaradıcılığının müxtəlif mərhələlərində bu mövzuya müraciət edərək bir sıra yaddaqalan portretlər yaratmışdır. 1950-ci illərdə dahi rəssam cəmiyyətimizin intellektual həyatında xüsusi yer tutan mədəniyyət xadimlərinin portret obrazlarının qalereyasını yaratmışdır: bu – Müğənni S.Qədimova (1957), Balerina R.Axundova (1955), Müğənni S.Aslanova (1957), Rəqqasə R.Cəlilova (1957) və bir çox başqalarıdır. Onun tablolarında lakoniklik və statiklik obrazların daxili, mənəvi hiss və duyğularının bizə şatdırılmasında müstəsna əhəmiyyət daşıyır. Azərbaycan mədəniyyət və incəsənətinin tanınmış şəxsiyyətlərinin portretləri üzərində işləyib. Onun qadın obrazlı portretləri qalereyasından “Həyat yoldaşının portreti” (1953-1959), “Maral Rəhmanzadənin portreti” (1960), “Şubalı qadın” (1969) əsərlərini misal çəkmək olar.

Beləliklə, qadın mövzusu bədii mədəniyyətdə hər zaman populyar olan mövzulardan biridir. Qadın, gözəllik və təsviri sənət. Bu üç sözdəki bağlılıq həmişə bir- birini tamamlamışdır. Bu üç sözün məzmunu gözəl harmoniya yaradaraq bəşər sivilizasiyasının əsasını qoymuşdur.

**Ədəbiyyat**

1. “Mikayıl Abdullayev. Rəngkarlıq və qrafika”. Xalq Əmanəti, 2013-cü il.
2. “Tağı Tağıyev”. Sərvət, 2013.
3. “Mikayıl Abdullayev”. Sərvət, 2013.
4. “Böyükağa Mirzəzadə”. Sərvət, 2013
5. R.Əfəndi. “Azərbaycan incəsənəti”. Bakı,2007.

**Characteristics of Female Images in Azerbaijani Painting in 50s of XX Century**

**Summary**

A distinctive feature of Azerbaijani painting in the postwar period is the influx of modernity and the broad development of genres. Social realism is at the forefront of painting. Artists recreated the image of several women on canvas, glorifying their dedication and the beauty of their homeland. M.Abdullaev, B.Mirzazade, T.Tagiev and others were among the artists who skillfully worked during this period. In their works, they revived the image of women who were distinguished by their style and expressed their opinions in other areas, and chose their own path of art. Only in the post-war years, our artists, such as T.Tagiev and M.Abdullaev and others, painted a number of psychological portraits and gave impetus to the beginning of a new stage in the national portrait genre.

**Характеристика женских образов 50-х годов XX века в азербайджанской живописи**

**Резюме**

Отличительной чертой азербайджанской живописи в послевоенный период является наплыв современности и широкое развитие жанров. Социальный реализм выходит на первый план. Художники воссоздали образ нескольких женщин на холсте, прославляя их самоотверженность и красоту своей родины. М.Абдуллаев, Б.Мирзазаде, Т.Тагиев и другие художники были среди тех, которые умело работали в этот период. В своих работах они возродили образ женщин, отличавшихся своим стилем и высказавших свое мнение в других областях, и выбрали свой собственный путь искусства. Только в послевоенные годы наши художники, такие как Т.Тагиев и М.Абдуллаев и другие, написали ряд психологических портретов и дали толчок началу нового этапа в национальном портретном жанре.

**Reyçi: dos. S.Sadıqov**

Göndərilib: 09.04.2020 Qəbul edilib: 10.04.2020

## T O P L U N U N   İ Ç İ N D Ə K İ L Ə R

### FİLOLOGİYA   PHILOLOGY   ФИЛОЛОГИЯ



### HÜQUQ   THE LAW   ПРАВО

## FƏLSƏFƏ VƏ SOSİOLOGİYA PHILOSOPHY AND SOCIOLOGY ФИЛОСОФИЯ И СОЦИОЛОГИЯ



## SİYASİ ELMLƏR POLITICAL SCIENCES ПОЛИТОЛОГИЯ

## PSİXOLOGİYA PSYCHOLOGY ПСИХОЛОГИЯ



## PEDAQOGİKA VƏ PSİXOLOGİYA PEDAGOGY AND SYCHOLOGY ПЕДАГОГИКА И ПСИХОЛОГИЯ



## SƏNƏTŞÜNASIQ VƏ MEMARLIQ ART CRITICISM AND ARCHITECTURE ИСКУССТВОВЕДЕНИЕ И АРХИТЕКТУРА

www.aem.az AEM AZ EN TR RU

# "ELMİ İŞ"

## humanitar və ictimai elmlər üzrə aylıq beynəlxalq elmi jurnal

Jurnalda aşağıdakı sahələr üzrə məqalələr dərc edilir:

- Tarix və antropologiya
- Filologiya
- Hüquq elmləri
- Fəlsəfə və sosiologiya
- Siyasi elmlər
- Psixologiya
- Pedaqogika
- Sənətşünaslıq və memarlıq

Məqalələr Azərbaycan, ingilis, türk və rus dillərində qəbul olunur

### Məqalələrin texniki tərtibatına dair tələblər

**Həcmi**
Məqalələr - 8-25 səh.
**Mətnlər** Microsoft Word mətn redaktorunda A4 formatda, hər tərəfdən 2 sm olmaqla Times New Roman şrifti ilə 14 pt ölçüdə, 1,5 sətirarası intervalla, 1 sm abzasla yığılmalıdır.
**Müəllif haqqında** məlumat **sağdan, qalın şriftlə** aşağıdakı qaydada tərtib olunmalıdır:
Müəllif(lər)in adı, atasının adı, soyadı (yalnız ilk həriflər böyük olmaq şərti ilə)
Bu məlumatdan aşağıda müəllif(lər)in iş yeri (qısaltmalardan istifadə etmədən) adi şriftlə (nə qalın, nə kursiv) göstərilməlidir, əgər müəllif məqalə nəşrə təqdim olunan zaman heç bir elm və ya təhsil (orta və ya ali) müəssisəsində çalışmırsa, o zaman iş yeri əvəzinə yaşadığı şəhər və ölkə göstərilir. Müəllifin vəzifəsinin, elmi adı və ya elmi dərəcəsinin göstərilməsinə ehtiyac yoxdur!
Müəllif(lər)in şəxsi **elektron poçt** ünvanı **mütləq şəkildə** iş yeri məlumatlarından sonrakı sətirdə e-mail sözü yazılmadan göstərilməlidir.
**Məqalənin adı** - ortadan böyük hərflərlə (Caps lock-dan istifadə edilərək) qalın şriftlə verilməlidir.
***Açar sözlərlə məqalənin adı arasında məsafə*** aşağıdakı qaydada verilməlidir:
Abzas - interval: əvvəl - 0, sonra - 10
Açar sözlər (Azərbaycan dilində)
Key words (ingilis dilində)
Ключевые слова (rus dilində)
3-6 arası açar söz olmalıdır
İlk olaraq məqalənin yazıldığı dildə olan açar sözlər verilməlidir.
"Açar sözlər", "Key words", "Ключевые слова" söz birləşmələri qalın kursivlə, sözlərin özü isə sadəcə kursivlə yazılmalıdır.
**Məqalənin mətni aşağıdakı hissələrdən ibarət olmalıdır:**
**Giriş** məqalənin aktuallığını və elmi yeniliyini əks etdirməli və 5-10 cümlədən ibarət olmalıdır.
Girişdən sonra başlıqsız olaraq məqalənin əsas mətni başlamalıdır.
Bu iki hissə arasında məsafə "Abzas - interval: əvvəl - 0, sonra - 10" qaydası ilə təyin edilməlidir.

Məqalənin sonunda mütləq olaraq **Nəticə** hissəsi verilməlidir. Nəticə 5-10 cümlədən ibarət olmalıdır və sıra nömrəsi olmadan məqalənin əsas nəticələrini əks etdirməlidir. ("Nəticə" sözü Caps lock-la qalın hərflərlə ortada verilməlidir). Əsas mətnlə Nəticə arasındakı məsafə "Abzas - interval: əvvəl - 0, sonra - 10" qaydası ilə təyin edilməlidir.
**İstinadlar** mətnin içərisində aşağıdakı qaydada yazılmalıdır:
Mətndə mənbənin (fikrin) müəllifi göstərilmədikdə
Müəllifin soyadı - vergül - interval, mənbənin nəşr ili - iki nöqtə - interval - səh. ***Nümunə***: Axundov, 2005: 201)
Əgər müəllifin adı mətndə çəkilirsə o zaman bu qaydada yazılmalıdır: "...A.Axundov (2005: 205) qeyd etmişdir ki..."
**Ədəbiyyat siyahısı** məqalədə **istinad ardıcıllığına uyğun** olaraq aşağıdakı qaydalarla sıra nömrəsi ilə qeyd olunmalıdır və **Ədəbiyyat** kimi verilməlidir.
Məqalənin hazırlandığı dildən fərqli digər iki dildə məqalənin adı göstərilməklə **7-8 cümlədən ibarət Xülasə** yazılmalıdır.
Xülasənin mətnində "Bu məqalədə filan məsələ araşdırılır..." kimi cümlələr qəti şəkildə istifadə olunmamalıdır! Mətndə məqalənin elmi yeniliyini, araşdırılan mövzuya dair fikir və bir-iki cümləylə əldə olunan nəticə izah edilməlidir.
"Xülasə" sözü yazılanda qalın hərflərlə yalnız "X" hərfi böyük yazılmalıdır.
Xülasədə mütləq məqalənin adı verilməlidir!
Xülasənin xarici dillərə tərcümə edilərkən qəti olaraq elektron tərcüməçilərdən istifadə olunmamalıdır.
Cədvəl və şəkillər nömrələnir və bilavasitə mətndə yerləşdirilir. Cədvəl sözü və cədvəlin nömrəsi cədvəlin üst tərəfindən qalın hərflərlə yazılmalıdır.
Məqalənin məzmununa görə məhsuliyyəti müəllif daşıyır.
Redaksiya məqalənin əsas məzmununa xələl gətirmədən redaktə dəyişiklikləri və ixtisarları etmək hüququnu özündə saxlayır.
Məqalələrin məzmunu orjinal, yeni elmi fikir və nəticələri əks etməlidir.
Məqalə tələblərə cavab vermədiyi halda çap olunmur və müəllifə qaytarılmır.
Məqalə həm kağız, həm də elektron formada redaksiyaya təqdim olunmalıdır.
Elmi dərəcəsi olan mütəxəssisin rəyi mütləq şəkildə yazılı şəkildə (imza müəssisə möhürü ilə təsdiq olunmaq şərti ilə) redaksiyaya təqdim olunmalıdır.
Məqalənin sonunda əlaqə üçün telefon nömrəsi qeyd olunması vacibdir.
Məqalənin faylının adında yalnız müəllifin adı və soyadı göstərilməlidir.

**Redaksiya ünvanı:** Bakı ş., Mətbuat pros., 529,
"Azərbaycan" Nəşriyyatı, 6-cı mərtəbə.
www.aem.az saytında məqalələr onlayn yerləşdirilir.
E-mail: elmmerkezi@gmail.com
Tel.: +994 (012) 510 63 99
+994 (050) 209 59 68
+994 (055) 209 59 68

Çapa imzalanmışdır: 28.02.2020
Kağız formatı:
H/n həcmi:.
Sifariş: 256

"ZƏNGƏZURDA" çap evində çap olunub
Ünvan: Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
Tel.: (050) 209 59 68; (055) 209 59 68; (012) 510 63 99
e-mail: zengezurda1868@mail.ru

